## DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ

**Vəliyeva Çimnaz Həsən qızı**
Azərbaycan, Bakı şəhəri

# DİLLƏRİN QARŞILIQLI ƏLAQƏSİ: SUBSTRAT, SUPERSTRAT VƏ ADSTRAT

***Açar sözlər:*** *dilçilik, assimilyasiya, dillərin çarpazlaşması, dillərarası əlaqə, müqayisə*
***Key words:*** *luinguistic, assimilation, language crossing, interlanguage contact, compare*
***Ключевые слова:*** *лингвистика, ассимиляция, скрещивание языков, межъязыковые контакты, сравнение.*

Cəmiyyət inkişaf etdikcə, müxtəlif xalqlar təşəkkül tapdığı kimi müxtəlif dillər də meydana çıxmış və zəngin tarixi inkişaf yolu keçmişdir. Yer üzündə mövcud olan dillər mütəmadi olaraq bir-biri ilə əlaqədədir, bu əlaqələrin nəticələrini isə dilçiliyin sosiolinqvistika sahəsi öyrənir. Dillərin təması və kontaktı məsələlərinin tədqiqinə başlanılması XIX əsrin başlanğıcına təsadüf edir. Alman dilçisi Vilhelm fon Humboldt dilləri daha yaxşı anlamaq və öyrənmək üçün onları müqayisə edir, bir-biri ilə əlaqələndirir və yalnız XX əsrin ikinci yarısından etibarən aktual bir problemə çevrilmiş anlayışların əsasını qoyur.

Dillərin inkişafı və dəyişilməsi anlayışlarını bir-birindən fərqləndirmək lazımdır. Hər bir dəyişiklik hələ inkişaf demək deyildir. İnkişafdan yalnız dil sisteminin mürəkkəbləşməsi şəraitində bəhs etmək olar. Bundan başqa, “Dilin inkişafının müəyyən mərhələlərində baş verən dəyişmələr təkcə dilin daxili inkişaf qanunları ilə izahını tapmır. Bu dəyişmələr xalqın ümumi tarixi inkişaf kontekstində öyrənilir. Hər bir xalqın öz dili olduğu kimi, öz tarixi, öz yaşayış ərazisi vardır. Bu üç amilin qarşılıqlı təsiri dil əlaqələri üçün əsas yaradır”. (1.s.2)

Dillərin inkişafı mənzərəsində dildaxili (intralinqvistik) və dilxarici (ekstralinqvistik) amillər fərqləndirilir. Dillərarası əlaqələr ekstralinqvistik amillərin məhsuludur. “Dilçilik elmində dillərin bir-biri ilə əlaqəsi, qarşılıqlı münasibəti, birinin digərinə olan zahiri və daxili təsiri dil kontaktı anlayışının məzmununu təşkil edir. Bu anlayışı ifadə etmək üşün dilçilikdə “dil kontaktı” terminindən istifadə olunur” (2.s.369-370). Dillərin qarışması və çarpazlaşması dillərin tarixi inkişafına təsir göstərən mühüm xarici amillərdən biridir. Çarpazlaşma elə bir prosesdir ki, bu zaman dillərdən biri digər dilin bəzi elementlərini qəbul edir, lakin öz müstəqilliyini qoruyub saxlayır. Bəzən yeni bir dil meydana gəlir, bəzən isə iki dildən biri məğlub olaraq aradan çıxır. Dillərin çarpazlaşması zamanı əsasən dilin leksikası, çox az hallarda fonetikası, sintaksisi və fonologiyası xarici təsirlərə məruz qalır. Heç bir dilin morfologiyası, demək olar ki, bu təsirlərə məruz qalmır, iki morfoloji sistemin qarışaraq, orta bir sistemə çevrilməsi mümkün deyil. Müəyyən bir fenomin başqa bir dilə keçməsi isə çox çətin bir prosesin nəticəsidir. Belə ki, dünya dillərinin inkişafı tarixində hər hansı dildə yeni sait və ya samit fonemin meydana çıxması olduqca az təsadüf edilən mürəkkəb bir hadisədir.

Müqayisəli-tarixi dilçilikdə çarpazlaşma dedikdə üç anlayış – substrat, superstrat və adstrat nəzərdə tutulur. Dillərin qarşılıqlı təsiri, bəzən qarışması zamanı dillərdən biri assimilyasiyaya uğrayır, istifadədən çıxır, bununla belə izsiz itmir, onun izləri qalib dildə qalır. Substrat və superstrat hadisəsi bu şəkildə meydana çıxır.

Substrat (latın dilində sub – alt və stratum – təbəqə, qat) əvvəllər müəyyən coğrafi bir ərazidə mövcud olan yerli dilin istila nəticəsində ona qalib gələn xalqın dilindəki izləridir. A.Axundov onun tərifini belə verir: Çarpazlaşma zamanı məğlub olan yerli dilin qələbə çalan gəlmə dillərdəki izlərinə substrat deyilir. (3.s.120) Başqa sözlə, bir xalqın digər bir xalq tərəfindən istilası nəticəsində dil laxlayır, əhali tədricən başqa dilə keçir, bəzən yeni bir dil yaranır və dillərin təması və çarpazlaşması nəticəsində məğlub dilin ünsürləri qalib dildə qalır.

Substratın alınmalardan fərqi ondandır ki, o, gəlmələr tərəfindən yerli əhalinin assimilyasiyasının və etnik qarışmasının məhsulu olan tarixi bir prosesdir və etnosun formalaşmasında mühüm tarixi yükə malikdir. “Dilçilik elmində iki dilin çarpazlaşması şəraitində üstünlük qazanmış dilin lüğət tərkibi və qrammatik quruluşundakı izlərin, əlamətlərin, ünsürlərin öyrənilməsi substrat (substratum) adlanır. Bu latın mənşəli sözün mənası “bünövrə”, “astar” deməkdir. Substrat nəzəriyyəsini inkişaf etdirmək müasir dünya dilçiliyinin təxirəsalınmaz vəziyyətlərindən biridir.” (4.s.4) Substrat hadisəsinə misal olaraq, latın dilindən törəyən roman dillərini göstərmək olar. Roma imperiyasının müasir dövrdə başda Fransa olmaqla Qərbi Avropanın böyük bir hissəsini tutan Qalliyanı zəbt etməsi nəticəsində yerli kelt dili sıxışdırıldı, bilinqvizm

yarandı və latın dilinin ənənələrini davam etdirən fransız və ispan dilləri meydana çıxdı. Və yaxud Balkan yarımadasının qədim sakinlərinin artıq mövcud olmayan frakiya dilinin (hind-avropa dilləri) izlərinə gəlmə xalq olan yeni balkan dillərində rast gəlinir.

Dilə kənar təsir kimi qiymətləndirilən substrat bütün səviyyələrdə - leksik, qrammatik, fonetik – özünü göstərir. Bir dildən başqa bir dilə keçid çox uzun və ağır bir prosesdir və substrat dedikdə dilin sadəcə təhrif olunması, yaxud da leksik səviyyədə dəyişikliklər nəzərdə tutulmur, bu, hər şeydən əvvəl, dilin inkişafının daxili qanunlarının pozulması deməkdir. Ümumiyyətlə, substrat mənşəli sözlər bütün dillərdə mövcuddur, ən davamlı substrat fonetik substratdır. Misal üçün, qallar latın dilində danışarkən belə öz ana dillərinin fonetik xüsusiyyətlərini qoruyub saxlamışdılar.

“Azərbaycan dilinin bəzi dialekt və şivələrində substrat əlamətləri müşahidə olunur. “Azərbaycan dilinin Zaqatala-Qax şivələrində təsadüf edilən q<k hadisəsi (qomaq “kömək”, inaq “inək”, qişi “kişi”) görünür, Qafqaz dilləri qrupuna daxil olan substrat əlamətidir.” (3.s.121) A.Axundovun fikrincə Bakı dialektindəki a>o əvəzlənməsi də, çox güman ki, substrat əlamətidir və eyni hadisənin özbək dilində də özünü göstərməsi bu substratın İran mənşəli olduğunu söyləməyə haqq verir.

Dilçilikdə substrat nəzəriyyəsini XIX əsrin başlanğıcında danimarkalı alim Y.Bredsdorf irəli sürmüşdür. Bu nəzəriyyə sonradan, həmin əsrin 60-70-ci illərində italyan dilçisi Q.İ.Askoli tərəfindən inkişaf etdirilmişdir.

Dil təmaslarının digər bir forması superstratdır (latın dilində super üzərində, stratum təbəqə, lay). Superstrat substratın tam əksinə olan hadisədir. Bu zaman gəlmə dil fəth edilmiş, yaxud tabe edilmiş yerli əhali üzərində mədəni hökmranlığa müvəffəq olmayaraq, məğlub olur, yerli dil ənənələri öz əhəmiyyətini qoruyub saxlayır, ancaq həmin dilin müxtəlif səviyyələrində, misal üçün, leksika və ya qrammatika səviyyəsində xarici elementlərin təsiri hiss olunur, başqa sözlə, gəlmə dilin yerli dildə izlərinə superstrat deyilir. Dil sadəcə gəldiyi yeni ərazidə məğlub olur, öz doğma mühitində isə varlığını saxlayır. Normanların 1066-cı ildə İngiltərəni istila edirlər, lakin onların özləri ilə gətirdikləri qədim fransız dili yerli əhalinin dilinə çevrilmədi, sadəcə ona müəyyən qədər təsir göstərdi. Başqa bir misal: bir sıra dillərdə “korsar” şəklini alan latın dilindəki “*cursarius*” sözü çuvaş dilində xarsăr “cəsarətli”, balkan dillərində ğursuz “zalım”, türk dilində hırsız “oğru” və sair şəkillərdə istifadə olunur.

Eyni fikirləri azərbaycan dili haqqında da demək olar. Tarix boyunca azərbaycan xalqı da yadellilərin işğallarına məruz qalmışdır. İstilalar nəticəsində dilimizin fonetik, leksik və qrammatik səviyyələrində digər xalqların dillərinin təsiri, başqa sözlə, superstrat hadisəsi müşahidə olunur. VII əsrdən başlayaraq dilimizə ərəb və fars dillərindən, XIX əsrdən isə rus dillərindən sözlər keçmişdir. Ərəb dili müsəlmanların müqəddəs kitabı Quranın dili olduğuna görə bu dildən dilimizə keçən sözlər əsasən dinlə, ilahiyyatla bağlıdır. Azərbaycanın Rusiyanın tərkibinə daxil olması nəticəsində dilimizə keçən rus superstratları xalis rus sözləri ilə yanaşı həmçinin Avropa dillərindən rus dilinə keçmiş və rus dilinin fonetik xüsusiyyətlərini qəbul etmiş sözlər daxildir. Ümumilikdə isə, azərbaycan dilində ərəb və fars superstratlarının neçə-neçə yüzilliyi əhatə edən güclü leksik izləri mövcuddur.

Substrat və superstrat hadisələrindən göründüyü kimi xalqın hökmranlığı ilə dilin hökmranlığı iki fərqli anlayışdır. Substrat hadisəsi zamanı hakim dil hakim xalqın dilidir, bu da tabe edilən xalqın dilinin tədricən əriyib yox olması ilə nəticələnir. Superstrat hadisəsi zamanı isə hakim dil tabe edilmiş xalqın dilidir, bu da hökmran etnosun dilinin yad ərazidə əriyib yox olması ilə nəticələnir.

Lakin iki dil qarşılıqlı təmasda və yanaşı mövcud olursa, bununla belə heç biri əriyib yox olmursa, bu hadisə adstrat (latın dilində ad – yaxın, yaxınlıqda, stratrum – lay, təbəqə) adlanır. Başqa sözlə, adstrat müxtəlif dillərdə danışan xalqların uzun müddət eyni ərazidə və ya qonşuluqda yaşaması nəticəsində meydana gələn ikidillilikdir. (6.s.92) Bu zaman dilin qrammatik quruluşu toxunulmaz qalır, qarşılıqlı təsirin dərəcəsi və intensivliyi isə tarixi şərtlərdən və dillər arasındakı qohumluq dərəcələrindən asılıdır. Müxtəlif dillərin daşıyıcıları olan xalqların və etnosların arasında tarixən iqtisadi, sosial, mədəni, siyasi əlaqələrin yaranması, inkişaf etməsi dil əlaqələrinin təkanverici qüvvəsidir.

Buna misal olaraq, Balkan dillərindəki Türk adstratı elementlərini, və ya özbək dilindəki tacik adstratını, çuvaş dilindəki tatar adstratını, fars və tacik dillərindəki türk adstratını misal göstərmək olar. Bu zaman məğlub və qalib dil, etnik assimilyasiya anlayışlarından istifadə olunmur. Bəzən adstrat terminindən qarışıq bilinqvizmi ifadə etmək üçün də istifadə edilir. Bu anlayış ilk dəfə 1939-cu ildə italyan linqvist Bartoli tərəfindən daxil edilsə də, dilçilikdə substrat və superstrat qədər böyük əhəmiyyətə malik deyil və dilçilik ədəbiyyatında ona çox az şərh verilmişdir. Adstrat hadisəsinə misal olaraq, IX-XI əsrlərdə skandinav dillərinin ingilis dilinə göstərdiyi təsiri göstərmək olar.

Substrat və superstratdan fərqli olaraq, adstrat hadisəsi dillər arasındakı neytral xarakterli qarşılıqlı əlaqədir. Başqa sözlə, "bu zaman dillər arasında etnik və dil səviyyəsində assimilyasiya baş vermir, bir dil digər dil üzərində hökmranlıq etmir." (7.s.6)

**Ədəbiyyat:**

1. İ.Hüseynova, Nitq mədəniyyəti (Qloballaşma və multikulturalizm şəraitində dilin inkişafı), elibrary.az/docs/jurnal/jrn2017_284.pdf
2. N.Seyidəliyev, Afad Qurbanov və ümumi dilçilik, Bakı, 2019.
3. Axundov A. Ümumi dilçilik, Bakı, "Maarif", 1988.
4. ADU-nun elmi xəbərləri, cild 2, № 3, 2017.
5. Nadirov Ö.V., Məhərrəmova Ş.M. Azərbaycan terminologiyasının zənginləşməsində rus dilinin rolu, (Müasir dilçiliyin aktual problemləri, beynəlxalq elmi konfransların materialları), Sumqayıt, 2016.
6. Жеребило Т.В. Термины и понятия лингвистики: Общее языкознание. Социолингвистика, Пилигрим, 2012.
7. Heydərov R. Dillərarası əlaqələr və dillərin inkişafı məsələləri, Bakı, 2008.
8. Rəcəbli Ə. Ə. Nəzəri dilçilik, Bakı, Nurlan, 2003, s. 480.
9. André Grosse, À propos du superstrat du français, Bruxelles, 1994.
10. Ахманова О.С. Словарь лингвистических терминов, Едиториал УРСС, 2004

**Languages relations: substrat, superstrat, adstrat**

**Summary**

Languages of world have always been correlated to each other. In the context of the development of languages, we can distinguish internal (intralinguistic) and external (extralinguistic) factors. Linguistic relations are the product of extralinguistic factors. The language convergence includes two concepts: substrate and superstrat. Adstrat is a coexistence and contact of languages of the people living for a long time in the neighboring territories.

**Взаимодействие языков: субстрат, суперстрат и адстрат**

**Резюме**

Языки мира связаны между собой. В контексте развития языков различают внутриязыковые (интралингвистические) и внешние (экстралингвистические) факторы. Межязыковые отношения являются продуктом экстралингвистических факторов. Скрещивание языков включает в себе два понятия: субстрат, суперстрат. Адстрат сосуществование и соприкосновение языков народов длительное время проживающих на соседних территориях.

**Rəyçi: dos. İ.Məmmədli**

**Əhmədova Səidə Məhiyəddin qızı**
N.H.Cəbiyev adına tam orta məktəb
Yardımlı,Azərbaycan
*seide-86@mail.ru*

# İNGİLİS VƏ AZƏRBAYCAN DİLLƏRİNDƏ QRAMMATİK KATEQORİYALARIN İFADƏ VASİTƏLƏRİ

***Açar sözlər:*** *kateqoriya, şəxs, kəmiyyət, feil, növ*
***Key words:*** *category, person, quantitative, verb, type*
***Ключевые слова:*** *категория, личная, количественный, глагол, тип*

## Giriş

Bütün dillərdə kateqoriya anlayışı fəlsəfi termin kimi daha geniş məhfumdur. Qrammatik kateqoriya bir qrup sözlərin qrammatik təsirlərin nəticəsi olaraq dəyişməsidir. Məsələn *oğlan* sözü sadə bir söz olsada, təklikdə geniş bir fikir bildirməsə də, cümlə daxilində bir neçə qrammatik kateqoriyanı daşıya bilər. Məslən, o, ağıllı oğlandır cümləsində adlıq hal, üçüncü şəxsin təki müşahidə olunur. Bunlar da hərəsi ayrı ayrılıqda müəyyən bir kateqoriyanı ifadə edir [1]

Azərbaycan dilində ümumi qrammatikanın sərhədləri müxtəlif şəkildə göstərilib və bu da öz növbəsində müəyyən qarışıqlığa səbəb ola bilir. Əslində nitq hissələri qrammatik morfoloji xüsusiyyətlərinə görə fərqlənsələr də, kateqoriyaya daxil olarkən birləşə bilirlər. Əgər hər hansı bir kateqoriyanı bir neçə nitq hissəsində görəriksə, bu , ümumi kateqoriyaya aiddir. Lakin verilən nitq hissəsinin yalnız özünə aiddirsə və həmin xüsusiyyəti başqa nitq hissəsində müşahidə etmiriksə, bu xüsusi kateqoriyaya aiddir. Əslində eyni hal ingilis dilinin də qrammatik kateqoriyalarına aiddir. Bəs ingilis və Azərbaycan dilində bu kateqoriyaların nə kimi oxşar və fərqli xüsusiyyətləri var? Onların işlənmə yerlərində, leksik və qrammatik xüsusiyyətlərində nə kimi fərqlər mövcuddur?

Azərbaycan dilində hal kateqoriyası var ki, ingilis dilində biz onlari mensubluq bildirən, istiqamət və yer bildirən, başlanğıc nöqtə bildirən və s.kimi sözönləri ilə əvəz edə bilərik.İngilis dilində yalnız yiyəlik halı və sıfır morfologiyaya xas olan adlıq halı müşahidə etmək olar. Digər tərəfdən də mənsubiyyət kateqoriyası ingilis dilində birinci tərəfdə işlənən yiyəlik əvəzlikləri və ya yiyəlik halda olan isimlərin köməyi ilə müşahidə olunur. Azərbaycan dilində yalnız mənsubiyyət şəkilşilərini işlətməklə bu kateqoriyanı anlamaq olar. İngilis dilində *my book* ikili birləşməsi dilimizdə sadəcə *kitabım* sözü ilə əvəz edilə bilər. Başqa bir ümumi kateqoriya şəxs kateqoriyasıdır ki, digər kateqoriyalar kimi fərqli xüsusiyyətlər daşıyır. Belə ki, dilimizdə xüsusi şəxs şəkilçiləri mövcuddur ki, onların vasitəsilə neçənci şəxsin tək və ya cəm olması aydın olur. Ümumiyyətlə, Azərbaycan dilində şəxs kateqoriyasına dair ikili fikirlər mövcuddur. Belə ki, onu mübtədaya görə dəyişmə xüsusiyyəti ilə bağlı olaraq xəbərlik kateqoriyası da adlandıranlar vardır. Birinci tərəfdarlar olan N.K.Dmitriyev, M.Hüseynzadə, H.Mirzəyev şəxs şəkilçisini xəbərlik şəkilçisi adlandırıb onu xəbərlik kateqoriyasına aid edirlər. Onların fikrincə hökm məhz bu kateqoriya sayəsində baş verir və fikir bitmiş olur. M.Hüseynzadə isə bu şəkilçiləri isimdə xəbərlik, feildə isə şəxs kateqoriyası olması tərəfdarıdır. Lakin o zaman onlar iki fərqli funksiyanı yerinə yetirən omonim şəkilçi kimi qəbul edilər. Bu zaman o,nitq hissəsi kimi morfologiyaya, xəbərlik xüsusiyyətinə görə isə sintaksisə aid olur. Bununla da fərqli fikirlər müəyyən mürəkkəbliyə və həll olumaz məsələyə gətirib çıxarır. Z.İ.Budaqov isə hər ikisini şəxs kateqoriyasına aid etmişdir. Məhz bu cür fərqli yanaşmalar bu kateqoriyanın sərhəddini müəyyən etməyə mane olur [2,s151-282].

İngilis dilində isə isimlərdə xüsusi şəxs şəkilçisi mövcud deyildir. Şəxs əvəzlikləri və ya adlıq halda verilən isimlər özündən sonrakı ismin tək və ya cəmini müəyyən edir. Şəxs şəkilçilərini isə isimdə *to be* köməkçi feilinin formaları və ya digər köməkçi sözlər əvəz edir. Feillərdə isə yenə şəxslər, köməkçi feillər və ya indiki zamanda üçüncü şəxsin şəkilçisi bu sərhədi müəyyən edir.(Məsələn,I *am* a student-şagird*əm*)

Ümumi kateqoriyalardan olan kəmiyyət kateqoriyası isə həm riyaziyyat, həm də dilçilik elmində geniş şəkildə işlənən kateqoriyadır. Kəmiyyət kateqoriyasının ifadə vasitələrinə saylarla yanaşı, bəzi topluluq bildirən isimlər də daxildir. Məsələn qeyd olunan hər iki dildə su(water), yağ(butter), un(flour), süd(milk) və s.kimi toplu halda verilən eyni zamanda da cəmlənməyən, sayıla bilməyən isimlər mövcuddur. Kəmiyyət kateqoriyası hər iki dildə müxtəlif üsullarla göstərilə bilər. Buraya leksik( camaat-people), morfoloji(dost*lar*-friend*s*), sintaktik(bir cüt-a pair) kimi üsullar daxildir.

İnkarlıq kateqoriyası da hər iki dildə ümumi kateqoriyaya xas xüsusiyyətlərə malikdir. Belə ki, bu kateqoriyanı həm isim,sifət, say, əvəzlik, həm də feil kimi bir çox nitq hissələrinə aid etmək olar.

Azərbaycan dilində inkarlıq kateqoriyasının leksik (yoxdur, deyil), morfoloji (*ma* şəkilçisi), sintaktik (nə,nə də, heç nə, heç cür) üsullarla yaranması mümkündür. İngilis dilində ən çox leksik (nobody, nothing) və sintaktik (do not, is not) üsulları müşahidə etmək olar.

**Müqayisəli metod**.

Bir çox dillərdə feilin kateqoriyaları geniş bölmələrdən biridir. Azərbaycan və ingilis dilini müqayisə edərək bu kateqoriya ilə bağlı oxşarlığı və fərqliliyi görə bilərik. Bəs bu kateqoriyaların dilimizdə ifadə vasitələri nələrdir? Bu kateqoriyaların bəziləri ümumi kateqoriya olaraq yuxarıda da qeyd olunmuşdur. Lakin feilə aid olan bəzi xüsusi kateqoriyalar var ki, onlar dilimizdə müxtəlif vasitələrlə qarşılığını taparaq ifadə olunur. Bunlardan zaman,mud(mood), tərz(aspect), və növ(voice ) modallıq, uzlaşma kateqoriyaları xüsusilə qeyd olunmalıdır. Qeyd etdiyimiz kimi şəxs kateqoriyası Azərbaycan dilində şəxs şəkilçiləri ilə ifadə olunduğu halda, ingilis dilində feilin şəxsə tabeliyi mütləqdir və sərbəst ifadə olunmur (I speak-danışıram). Feilin ən geniş və dilimizdə də müəyyən fərqliliyə malik kateqoriyalarından biri zaman kateqoriyasıdır. Hər iki dildə keçmiş, indiki, gələcək zaman mövcuddur. Lakin ingilis dilində 16 zaman formasının olması onun tərz kateqoriyası ilə bağlıdır. Belə ki, tərz kateqoriyası özü bitmiş (perfect) və davam edən (progressive) olmaqla iki yerə bölünür və hər zamana xas bitmişlik və davamedicilik formaları olduğu üçün zamanların da sayı artır. Bəs əgər Azərbaycan dilində bu cür kateqoriya bölgüsü yoxdursa, onlar dilimizdə necə əvəz olunur? Azərbaycan dilində feil şəklinin hekayəti, feil şəklinin rəvayəti, şühudi keçmiş zaman, nəqli keçmiş zaman, qəti və qeyri qəti gələcək zaman formaları onları əvəz etməyə qadirdir. İngilis dilində zaman kateqoriyasına bağlı olan mud (mood) kateqoriyası özü indicative (nəqli cümlələr), imperative (əmr) və subjunctive (conditional ve suppositional olaraq şərt və güman bildirən ifadələr ) olmaqla üç əsas hissəyə bölünür və sonuncu mud dilimizə feilin şərt şəkli və qeyri qəti gələcək zamanın birləşməsinə uyğundur.Məsələn, If I were you, I would choose University of languages (Əgər yerinə olsaydım, Dillər universitetini seçərdim). *Voice* kateqoriyası isə dilimizdə qismən feilin məlum və məchul növləri ilə uyğunlaşır. Belə ki, ingilis dilində *active voice* dilimizdə məlum növlə tam uyğundur, *passive voice* isə məchul növ olaraq qeyd edilir, lakin dilimizdə məchul növün iş görən icraçısı məlum deyil, ingilis dilində isə icraçı passivdir. Yəni işin icraçısı mübtəda vəzifəsindən kənarlaşır lakin, bəzən cümlənin sonunda “by” sözönü ilə bərpa oluna bilər. Dilimizdə növ kateqoriyası bununla bitmir. Azərbaycan dilində əlavə olaraq icbar növ, qarşılıq birgəlik növ,qayıdış növ də vardır ki, bu da ingilis dilində müxtəlif nitq hissələri ilə və ya fərqli quruluşlarla ifadə olunur. İcbar növün ingilis dilinə qarşılığı *have* (və ya *get*)+noun(isim)+Participle II(feili sifət 2) ilə ifadə olunur. Məslən: Mən hər gün maşınımı yudurduram.( I have my car washed every day). Qarşılıq birgəlik növ isə dilimizdə morfoloji və sintaktik yolla ifadə olunarkən, ingilis dilində bu, müxtəlif leksik, sintaktik yollarla öz qarşılığını tapır.Məsələn, onlar yazışır(they write to each other). Qayıdış növdə isə iş görənin öz üzərində icra etdiyini nəzərə alsaq,dilimizin morfoloji quruluşuna görə məhz bu feillərin də xüsusi şəkilçiləri vardır, lakin ingilis dilində onları qayıdış əvəzlikləri ilə ifadə etməli oluruq.Məslən, o yuyunur (He washes *himself*). Qeyd olunduğu kimi Azərbaycan dilində bəzi feil kateqoriyaları ingilis dilində feildən uzaq olaraq tamamilə başqa nitq hissələri ilə əvəz edilməli oldu.

İngilis dilində mövcud olan kateqoriyalardan biri də modallıq kateqoriyasıdır ki, bu da dilimizdə xüsusi bir nitq hissəsilə əvəz olunur. Əslində bu kateqoriyaya aid olan feillər dilimizdə müxtəlif cür öz əksini tapır. Belə ki, ingilis dilində ***can*** modal feili dilimizdə müstəqil leksik mənaya malik olan ***bacarmaq*** feili ilə əvəz edilir. Lakin vaciblik bildirən ***must*** modal feili isə Azərbaycan dilində feilin vacib şəklinin şəkilçisi olan “***malı”*** ilə ifadə olunur. ***Need*** modalı isə feilin lazım şəklinin yerində işlənir. ***May*** modalı isə (icazə və güman mənalarında) ***olar*** feili ilə tərcümə edilir. Göründüyü kimi bu kateqoriyanı da bütöv şəkildə dilimizin qayda-qanunlarına görə bir kateqoriyaya aid etmək olmaz.

Feil kateqoriyalarından biri də ingilis dilində uzlaşma (agreement) məsləsidir. Əslində uzlaşma anlayışı dilimizdə də mövcuddur. Lakin Azərbaycan dilində mübtəda və xəbərə görə uzlaşma ön planda olarkən, ingilis dilində bu zamanların baş və budaq cümlədə yerinə görə müəyyənləşir. Məsələn ingilis dilinin qrammatik qaydalarına əsasən baş cümlədəki fikir keçmiş zamandadırsa, budaq cümlə də müvafiq olara keçmiş zamanın növlərini daşıyır(bəzi istisna halları çıxmaq şərtilə). Məsələn, “He said that he would go to the conference (O dedi ki, o konfransa gedəcək)” cümləsində *would* gələcək zamanın göstərici olan *will* köməkçi feilinin keçmiş zamana görə dəyişmiş formasıdır. Məhz uzlaşmaların tələbinə uyğun olaraq indiki sadə və keçmiş sadə, indiki davamedici və keçmiş davamedici, indiki bitmiş və keçmiş bitmiş, gələcək və keçmişə nəzərən gələcək və s.kimi müxtəlif uzlaşmalar görə bilərik. Şəxsə və kəmiyyətə görə uzlaşma isə ən çox indiki zamanda üçüncü şəxsin təkində və ya *to be* (olmaq), *to have* və s.kimi köməkçi feillərin formalarında xüsusi nəzərə çarpır. Azərbaycan dilində isə baş və budaq cümlədə zamanlara görə uzlaşma ingilis dilindən fərqli olaraq sərbəstdir.Məsələn, o dedi ki, mən getdim(gedirəm, gedəcəm) .[3,s137-185].

Qeyd olunanlardan belə nəticəyə gələ bilərik ki, dillər arasında müxtəlif tipoloji xüsusiyyətlər olsa da, onlar arasında kifayət qədər oxşarlıqlar da mövcuddur. Ən əsası müxtəlif dil qruplarına aid olsalar da, tərcümənin verdiyi zərurətdən irəli gələrək onları bir məxrəcə gətirmək və düzgün fikri çatdırmaq mümkündür. Qrammatik cəhətdən fərqli yerlərdə olan bəzi kateqoriyaları müxtəlif vasitələrlə birləşdirmək və ya əvəz etmək olar.

**Ədəbiyyat:**

1. www.englishclub.com/grammar
2. B. Xelilov, Müasir Azərbaycan dilinin morfologiyası I hissə, Bakı, Papirus NP 2016
3. M.Blokh, Theoretical grammar of English language, Moscow, High school,2004

**Expressive means of grammatical categories of English and Azerbaijan languages**
**Summary**

The article shows the difference between the grammatical categories of English and Azerbaijani languages. There are general and special categories in both languages. But it is certain that they have different expressive means. There are personal, quantitative, negative etc.categories as general categories. Different approaches of linguists on personal category are shown in the article.We can see the characteristic features of the categories of the verb too. They have different meanings in the given languages, specially English mood, voice,modality, aspect categories of the verb differ from others for their usage in our languages .But both languages have also general characters.

**Выразительные средства грамматических категорий английского и азербайджанского языков**
**Резюме**

В статье показана разница между грамматическими категориями английского и азербайджанского языков. На обоих языках существуют общие и специальные категории. Но несомненно, что они имеют разные выразительные средства. Существуют личные, количественные, отрицательные и т.д. категории как общие категории. В статье показаны различные подходы лингвистов к личной категории. Мы также можем видеть характерные черты категорий глагола. Они также имеют различные значения в данных языках, Английское муд, модальность, аспектные категории глагола отличаются от других тем, что они используются в нашем языке. Но оба языка имеют общие символы.

**Rəyçi: f.f.d.Ş.Dadaşova**

## ƏDƏBIYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ

**Золина Нигяр Чингиз гызы**
Самарский государственный социально-педагогический университет

# ГЕРМЕНЕВТИКА КАК МЕТОДОЛОГИЯ ГУМАНИТАРНЫХ НАУК

***Ключевые слова:*** *герменевтика, Библия, интерпретация, метод, семантика, текст*
***Açar sözlər:*** *hermenevtika, İncil, interpretasiya, üsul, semantika, mətn*
***Key words:*** *Hermeneutics, method, Bible, interpretation, semantics, text*

Одним из основных течений в современной философии считается герменевтика, которую в свою очередь называют философским учением о понимании. В процессе исторического развития, герменевтика сильно изменилась, пройдя путь от учения о методе (Шлейермахер и др. ) до учения о бытие (Х.-Г. Гадамер и др.).

Существуют много спорных вопросов в современной герменевтики, например: соотношение практики и теории, рационального и иррационального в герменевтике, проблему герменевтической логики. Занимаясь трактовок любого текста, мы делаем герменевтическую практику. Практика как и любой деятельности по трактовки текстов слишком обширно и неясно. Для понимания необходимо сравнить знание герменевтической практики с другими важными философскими убеждениями. Практику можно противоположить теории как единство правил, которые эту практику корректирует , и как правило , которая обязана такие правила детализировать, прорабатывать и выправлять при надобности. Вот здесь и начинаются трудности. Дело в том, что в рамках самой герменевтики, несмотря на то, что её проблемами плодотворно и в течение длительного времени занимались такие философы как М. Хайдеггер, В. Дильтей и Х.-Г. Гадамер, пока ещё не существует теоретического подхода, получившего всеобщее признание.

Вообще-то, в герменевтической философии уже много чего сделали: например, выяснили, что такое герменевтика, ввели правила толкования, которые приводят к полному пониманию текста. Нужно уточнить, что все правила немного размытые и работают только в определённых моментах. Надо сказать, что эти правила недостаточно обоснованы и формализованы. Можно, например, привести четыре канона (критерия правильности) интерпретации современного философа Э. Бетти. Это каноны автономии объекта (смысл текста независим от интерпретатора), тотальности (текст понимается как целое в соотношении с его частями), актуальности понимания (интерпретатор отталкивается от своего опыта, но не должен навязывать его тексту) и соотносимости смысла (интерпретатор должен преодолеть свои предрассудки). Но они носят довольно общий характер и не представляют разработанной теории.

Можно сказать, что существует два подходах в герменевтических исследованиях: «1) интуитивном (иррациональном, связанном с вдохновением) и 2) логическом (рациональном, направляемом методом)»[1]. Наиболее продуктивным методом надо считать совмещение обоих подходов. Проще говоря, герменевтика, которая стремится к наиболее полному пониманию, должна сочетать и рациональный, и иррациональный подходы. Даже в самом «темном», неясном тексте всегда есть нечто рациональное – это хотя бы то, что нам хотел сказать автор, всегда в тексте можно выделить (иногда и с большим трудом) цели, интенции, которые в него вложены. Современные исследователи в области герменевтической философии приходят к следующему выводу: «в силу никогда не исчезающего не рационализируемого компонента остатка в любом глубоком тексте, в нем будет сказано нечто помимо воли автора, вместе с тем, автор не может подавить свое стремление интерпретировать – только так он может понять собственный текст» [4]. В процессе интерпретации стремимся раскрыть отношение автора к предмету текста. Именно его отношение к предмету текста является «мостиком» к объективном смыслу. Мы не обращаемся к смыслу напрямую, а всегда делаем это с помощью автора, отталкиваясь от его текста. В этом заключается одна из сложностей герменевтической практики: в тексте нам никогда не дан смысл напрямую, он уже преломлен в сознании автора и языке. Мы вынуждены постигать объективный смысл, преодолевая субъективность автора и несовершенство языка (а язык всегда несовершенен, поскольку необходимо выразить бесконечные грани смысла). В то же время мы не можем полностью отказаться от автора и языка: ведь тогда и понимать будет нечего. Смысл всегда высказывается кем-то с помощью языка, он

не существует отдельно от человека и его речи. Здесь есть кажущееся противоречие: смысл объективен, и в то же время мы не можем познать его в отрыве от автора и его произведения. Но противоречие именно кажущееся, на деле здесь нет никакого противоречия. Объективный смысл не может быть дан нам вне языка и произведения автора, он не может упасть с неба, как божественное откровение. И сводить произведение только «к субъективному замыслу автора тоже нельзя, ведь тогда герменевтический процесс станет бессмысленным, т.к. при этом бесполезны интерпретации, которые ничего не добавляют к этому субъективному замыслу»[1]. Таким образом, мы видим, что смысл текста объективен, но дан нам через язык и произведение автора. Если в иррациональной герменевтике никакая логика, строго говоря, не является необходимой, а понимание осуществляется интуитивно, в ситуации инсайда, то в рациональной герменевтике можно говорить об особой герменевтической логике, на основе которой должна выстраивать структура понимания, включающая в себя его основные формы и этапы.

Герменевтическая логика – дисциплина, в которой исследуются логические основания, методы и правила понимания смысла текстов (знаково-символических систем). Она основана на принципе зависимости логического метода от предмета рассуждения, на интерпретационной природе рассуждений в области герменевтики, на принципе диалогичности герменевтического мышления.

«Герменевтический круг» является весомым элементом герменевтической логики. В формальной логике «герменевтический круг» является погрешностью, а в герменевтической логике – уникальной системой усиления сведения. Несомненно, не правильно было сравнивать герменевтический круг с логическим кругом формальной логики. Герменевтический круг является восходящую спираль. Как говорил В.Г.Кузнецов: «перед герменевтической логикой «встают проблемы совершенно необычные с точки зрения формальной логики, такие, например, как проблема прямого и косвенного значения, соотношения первоначального (этимологического) значения и узуса (обще употребительного значения) слова, «контекстного следования», «тропного следования», «энтимематического следования» и т.п.»[6].

В результате длительного исторического развития, в процессе которого герменевтическая логика приняла свое истинное лицо, по частицам собирая свое Филологическое содержание. Конечно, развитие герменевтического метода в какой-то мере повлияло на конституированние герменевтической логики. Первым достижением логического метода в герменевтической области сделал философ Х. Вольф, хотя герменевтической, на прямую, не занимался. Его считают создателем теоретических принципов для ключевого шага в будущее. Основателями идей герменевтической логики являются концепции Дильтея (см. Обоснование наук о духе), Шпета (см. Герменевтическая феноменология), Гадамера (см. Действен-но-историческое сознание), в которых были исследованы общие проблемы Герменевтической логики. «Герменевтика – это искусство избегать недоразумения» [3]. Еще в древности образовались три основные ветви герменевтики: религиозная, юридическая и филологическая, имеющие различия лишь по предмету и области деятельности человека, делаются первые попытки осмыслить понимание как теоретическую проблему. В эту историческую эпоху происходил переход толкования от устного к письменному. В отдельные эпохи религиозная, филологическая и юридическая герменевтики сближались и пересекались, в другие – определяли между собой четкие, непреодолимые границы. Мифология является одной из первых ступеней, где образовались основные правила истолкования текста. Язык богов затемнен и непонятен простому смертному. Платон в диалоге «Тимей» говорит о том, что пророческий дар является уделом человеческого умопомрачения, но уразумение (т.е. понимание) пророчества есть дело «неповрежденного в уме человека», откуда и возникла необходимость в особом «племени толкователей при тех, кто прорицает» [7]. К этому времени мы можем обнаружить первые подходы к оформлению герменевтики.

Аристотель, первый, кто обратил внимание на толкование текста. «Русское название его трактата «Peri hermenēias» («Об истолковании») представляет собой транскрипцию с латинского его заголовка «De interpretatione», предложенного в «Этимологиях» средневекового энциклопедиста Исидора Севильского»[2].Оно лишь приблизительно соответствует исходному греческому названию труда. Западно-европейские исследователи, как правило, называют данный трактат «Герменевтика». Перевод «Герменевтики» на сирийским языке, является самым ранним текстом дошедших до нас, перевел данное сочинение Проб. Именно Аристотель поднимал вопросы о направлениях истины в толковании текста. У Платона же герменевтика может толковать чужую речь, но не может оценить ее истинность. Искусство и поэзия у Платона сменяется логикой у Аристотеля.

Основной стадией становление герменевтической традиций стала эпоха средневековой христианской герменевтики, которая обозначается как «конфликт» между Новым и Ветхим Заветами. Новый завет применяется как ключ к Ветхому Завету. Религии нового времени нужно было сформировать свое мнение к античному искусству, что способствовало развитию герменевтики. В эту историческую эпоху герменевтика потеряла свое уникальность и самостоятельностью стала второстепенной наукой. В Библии, герменевтическое направление называется экзегезы.

В эпоху раннего христианстве получает свое дальнейшее развитие Александрийская школа во главе с Климентом Александрийским и возникает Антиохийская школа во главе с Ефстафием Антиохийским. В Александрии традиции толкования античных классиков экстраполируются на толкование Библии. В период патристики появляется работа Аврелия Августина «Христианская наука, или основания священной герменевтики и искусства церковного красноречия»[1]. Это первый фундаментальный труд по герменевтике. В работе Августина герменевтика получает мощный импульс к развитию. Августин обратился к ней как к системе правил для установления подлинного смысла Евангелия. Несмотря на сугубо теологический характер учения Августина, ряд его положений актуален не только в рамках теологии, в них заложены основополагающие идеи теории толкования в целом и юридической герменевтики в частности. Герменевтика времен Реформации переживает новый подъем в своем развитии. Герменевтику этого периода связывают с именем Матиаса Флациуса Иллирийского, теоретика протестантизма, создавшего «Ключ к истолкованию Священного Писания». Как указывает В. Кузнецов, «герменевтика, по Флацию, предназначена для указания пути и средств для понимания знака, для перехода от знака к значению, для перехода от общего значения к специфическому смыслу, от целого к частям и от частей к целому; средства герменевтического анализа при этом учитывают (должны учитывать) цель и замысел автора» [5].

Эпоха Возрождения также расширяет предмет герменевтики – за рамки толкования священных текстов, ее принципы распространяются на юриспруденцию, исторические науки и гуманитарное познание в целом. В XVII веке свои работы проблемам герменевтики посвящали В. Франц, Глассий, И. Турретин. В XVIII веке на развитие герменевтики оказывает влияние философия рационализма. Так, И.М. Хладениус выпустил в 1742 г. Книгу «Введение к правильному толкованию разумных речей и текстов», в которой была поставлена задача создания всеобщей герменевтики (однако объектом изучения оставались религиозные тексты). Хладениус «ставит вопросы о статусе особой герменевтической логики и о возникновении предпосылок для оформления особого раздела логического знания, …в котором логические системы создаются вновь для решения конкретных герменевтических проблем»[5]. В первой пол. 19 в. Профессор Берлинского университета Фридрих Карл фон Савиньи добился немалых побед в изучении вопросов светской герменевтики. Таким образом Савиньи смог коснуться главных позиций исторической философии 18 века. Деятельность философа Ф. Шлейермахера связывают с разработками новой эпохи. Он хотел воплотить в жизнь универсальную герменевтику, правила которой применялись бы и в филологии, юриспруденции и теологии. Хотя Шлейермахер при жизни и не создал полную «Герменевтику», ее собрали его ученики, по лекциям и записям самого философа. Последующие исследования на протяжении 19-20 в. Связывают с такими учёными как Г.Шпет, Г.Липпс, Г.Миша и с проблемами поднятыми Шлейермахером.

В теории Г.Г. Шпета и герменевтических идеях Миша и Липпса отмечаются схожесть важных штрихов герменевтической логики: «(её концептуальный, динамичный характер, синтез слова и понятия, принятие однозначности интерпретации) при значительном расхождении как в их обосновании (чёткий рационализм Шпета, субъективно-экзистенциальный подход Г. Липпса и опора на «философию жизни» у Г. Миша), так и в общей направленности герменевтик (у Шпета предметом герменевтики является социальная сфера, расширяемая им до размеров действительности вообще; у Липпса – субъективный экзистенциальный опыт; у Миша – «жизнь» как первичное, всеобъемлющее переживание)»[8]. Опровергается и осуждается важная функция родовидовых понятий. Но доказательства данных итоговых результатов обнаруживает значительные расхождения. Логика Шпета основывается на рациональных мотивах феноменологии. Его герменевтика направляется на социальное. Г. Липпс создаёт свою логику на экзистенциальном фундаменте. При этом экзистенция толкуется как личная экзистенция. Поэтому данная трактовка, соотношение и т.п. показывает довольно предвзято. Но такое усилие построить логику (с необходимой объективностью) на личной основе душевного разногласия. В исследованиях Г.Миша показывает основное увеличение логического в до рациональную отрасль данной «жизни», где, не преобразуют, а скидывают

формальную логику. Самобытность Шпета выступает в рационализме его структуры, обращённости к социальному. Цель концепций русского философа кардинально отличается от концепций его западных коллег. Из-за схожести общих штрихов наблюдений герменевтической логики демонстрирует важность этого исследования и нужность разбора данных исследований. Существование доказательств наблюдения в западной философии по данному вопросу отмечает безусловную современность и эффективность этой тенденции. Исследования показали большое количество похожих граней данных тем. В любом направлении герменевтическая логика становится интерпретационной логикой.

**Литература:**

1. Варыгин Д.В.: «Проблема понимания в современной герменевтике» [Текст] /Российский гуманитарный журнал. 2012. Т. 1. №1, М. 2012 . (1)

2. Васюк А. В. «Зарождение и развитие герменевтических идей как условие возникновения юридической герменевтики в России» [Текст] // Вестник Пермского университета Выпуск 2 (8), Пермь, 2010. [Электронный ресурс]. URL:(http://www.jurvestnik.psu.ru/index.php/ru/-28-2010/5-2010-12-01-13-31-58/-2-8-2010/48-zarozhdenie-i-razvitie-germenevticheskix-idej-kak-uslovie-vozniknoveniya-yuridicheskoj-germenevtiki-v-rossii) (данные соответствуют: 10.05.2019)

3. Габитова Р.М. Философия немецкого романтизма [Текст]. М.: Наука, 1989. 168 с.

4. Гижа А. Интерпретация и смысл (структура понимания гуманитарного текста) [Текст]: Монография. Харьков, 2005. 404 с.

5. Крусс В.И. Юридическая герменевтика: актуальные проблемы юридической науки. [Текст] Н. Новгород, 1999. 248 с.

6. Кузнецов В.Г. Логика гуманитарного познания. [Текст] // Философия и общество. 2009. № 4. С.22–63.

7. Писаревский А.Е. Юридическая герменевтика: Социально-философская методология интерпретации и толкования правовых норм [Текст]: дис. … канд. Филос. Наук. Краснодар, 2004. 194 с.

8. Терехов В.В. «Герменевтическая логика Г. Г. Шпета» [Текст] //Ученые записки Орловского государственного университета. Серия: Гуманитарные и социальные науки, Орлов, 2011 г.

**Qermenevtika humanitar elmlərin metodologiyası kimi**
**Xülasə**

Məqalədə qermenevtika elminin yaranması və inkişafı haqda bəhs olunur. Qermenevtika elm olaraq yarandığı gündən bu günə kimi çox dəyişmişdir. O metod haqda elmdən varlıq haqda elmə gədər dəyişərək inkişaf yolu keçmişdir.

**Hermeneutics as a methodology of the humanities**
**Summary**

This article shows the historical and philosophical development and the formation of hermeneutics as a science. In the process of historical development, hermeneutics've changed a lot: from the doctrine of the method to the doctrine of being.

**Рецензент: проф.Е.В.Абрамовских**

**Yaqubova Cahidə Etibar qızı**
Azərbaycan, Bakı şəhəri
ccahide@bk.ru

# NƏBİ XƏZRİNİN "SALATIN" POEMASINDA FOLKLOR ƏNƏNƏLƏRİ

***Açar sözlər:*** *Nəbi Xəzri, müqayisə, folklor ənənələri, qəhrəmanlıq, Burla xatun, Humay quşu*
***Key words:*** *Nabi Khazri, comparison, folklore tradition, heroism, Burla khatun, Humay bird*
***Ключевые слова:*** *Наби Хазри, сравнение, фольклорные традиции, героизм, Бурла Хатун, Жар-птица*

## GİRİŞ

Azərbaycan ədəbiyyatının görkəmli ustad sənətkarı Nəbi Xəzrinin ədəbiyyat aləminin zənginləşməsində, müasir şairlərimizin kamilləşməsində rolu böyükdür. Yaradıcılığında şifahi xalq ədəbiyyatına müraciət etsə də, müasir folklorşünaslığa uyğunlaşdırmışdır. Şair tarixi əsər yazarkən hadisəni, dövrün ruhunu dolğun şəkildə təsvir etməyi özü üçün məqsəd qoyur. Hər bir vətəndaş kimi ölkədə baş verən narahatlıqlar, çaxnaşmalar onu da düşündürür. Həsrət, iztirab, gerçəklər olduğu kimi əks edilir. Folklor qaynaqlarından yetəri qədər istifadə edərək yazılan "Salatın" poeması real həyat hadisələri əsasında qələmə alınıb. Baş qəhrəman Azərbaycanın şəhid jurnalist qadını Salatın Əsgərovaya həsr olunub.

## MİLLİ DƏYƏRLƏR, VƏTƏN SEVGİSİ VƏ REALLIQ

Nəbi Xəzri Salatın Əsgərova ilə təsadüfən bir qonaqlıqda tanış olur. Jurnalist şairə şeirlərini çox sevdiyini, hətta əzbər bildiyini söyləməsi şairi daha da ruhlandırır və sevindirir. Qarabağa yollanarkən düşmən tərəfindən Salatının öldürülməsi bütün Azərbaycanı yasa boğur. Hər bir vətəndaş kimi şair Nəbi Xəzrini də ölüm xəbəri məyus edir. Haqqında poema yazaraq xalqının dərdinə şərik olur, həm də şəhidimizin timsalında vətənpərvərlik hissləri aşılayır. Beləliklə, şair jurnalistin faciəvi həyatını qələmə alaraq dastan yaradır, ədəbiyyat aləmində əbədiləşdirir. Salatın Azərbaycanda baş verən dəhşətləri öz müxbir qələmi ilə xalqına çatdırır. Valideynləri, yaxınları, dostları mübarizənin qızğın bir zamanında Qarabağa yollanmasına etiraz edirlər, fikrindən döndərmək üçün çalışırlar. Hər şeyə rəğmən jurnalist fikrindən dönmür. Nəbi Xəzrinin poemanın "Yaralı Dağlar" şeirində qədim musiqi alətimizə olan sevgisi, dəyəri görülür. Qəhrəmanın qətlə yetirilməsinə nəinki xalq hətta onun ölümünə şahid olan təbiət, dağlar, güllər, çiçəklər, meşələr fəryad edir. Meşələrin yaşıllığı solur, güllər, çiçəklər qana boyanır. Şair deyir ki, əgər o "aşıq" olsaydı, əlinə sazı alardı, dağlar fəryadını sazla deyərdi: "Mən aşıq olsaydım, saz götürərdim, Dağlar fəryadını sazla deyərdim". Saz muğam ilə yanaşı Azərbaycan xalq mədəniyyəti ilə bağlıdır. Aşıq və saz ayrılmaz bir tərkibdirlər. Qədim musiqi aləti ilə aşıqlar şeirlər, dastanlar oxuyardılar. Salatın həm jurnalist, həm də övladına bağlı anadır. Müxbir xarakterinə, əməlinə görə "humay quşu" adlandırılır. Humay quşu türk mifologiyasına məxsus inancdır. O, yaxşılıqlar edir, ətrafına işıq saçır, uşaqları pisliklərdən qoruyur. Ana tanrı, ilahə kimi qəbul edilən "humay quşu" xoşbəxtliyin, səadətin rəmzidir. Məhz Salatın da "Ana Tanrı" kimi vətəni qorumaq üçün əlindən gələni edir, varlığı ilə günəş kimi parlayır. Nəbi Xəzri qəhrəmanlıq dastanına müraciət edir, poemanı "Dədə - Qorqud" dastanıyla yanaşı tutur. Çünki poemada mərdlik göstərən, qorxmadan həyatını təhlükəyə atan insan surəti var. Dədə Qorqud uzun illərin, əsrlərin keçməsinə baxmayaraq dəhşətli qətli eşidərək uzaqlardan gəlir. Şair bu nəticəyə gəlir ki, igidlərə bəzən şəhid olmaq yaraşır. Onlar Tanrı qatında ən yüksək zirvədə dayanırlar. "Dədə-Qorqud" dastanının sevilən qadın obrazı Burla Xatınla Salatın eyniləşdirilir. Burla Xatın Qazan xanın yoldaşı, Uruzun anası, Bayandır xanın isə qızıdır. "Salur Qazanın evinin yağmalandığı boy" - da o, əsir götürülür. Ailəsini, namusunu qorumaq üçün oğlu Uruzun öldürülməsinə razı olur. Döyüş zamanı ağır yaralanmış Qazanı müdafiə etmək üçün qılınc - qalxanla vuruşur. "Dədə - Qorqud" dastanının qadın qəhrəmanı Burla Xatın obrazında gördüyümüz qəhrəmanlığı, qorxmazlığı, sədaqəti eyni ilə Salatında görə bilirik. O da vətəni, doğma eli üçün ölümə hazırdır və düşünmədən qızğın döyüşlərin olduğu yerə gedir: "O gəldi dünyaya Salatın kimi, Burla Xatın kimi getdi dünyadan."

Mövcud ciddi dəyişikliklər jurnalistin xarakterinə təsir göstərir. Onun xarakteri, insani düşüncələri ciddi vəziyyətlərdə daha kəskin biruzə verir. Azərbaycanın şəhid verməsi, qanlı döyüşlər, torpaqlarımızın işğal edilmə istəyi Salatının qəlbində "Azadlıq yanğısı"-nı alovlandırır. Vətən uğrunda mübarizə, özünü fəda qədim zamanlardan igidlərimizin qanında olmuşdur. Oğuz igidlərimiz,

правилам. Логические и психологические исследования последних лет (начиная с конца 19-го века) вскрыли связь некоторых "механизмов" мышления с общематематическими и общелогическими понятиями. Широкие возможности в этом плане дает решение логических задач.

**Rəyçi: dos. T.B.Məmmədova**

**Süleymanlı Rabiyə Rizvan qızı**
Azərbaycan, Bakı
rabiye1997@mail.ru

# ŞAGİRDLƏRDƏ YARADICI TƏXƏYYÜLÜN İNKİŞAFI VƏ TƏRBİYƏ EDİLMƏSİ

***Açar sözlər:*** *təxəyyül, inkişaf, yaradıcılıq, fəaliyyət, təxəyyül surətləri, şagirdlər, metod*
***Keywords:*** *imagination, progress, creativity, activity, imagination images,students, methods*
***Ключевые слова:*** *воображение, прогресс, творчество, активность, воображение образы, ученики, методы*

## Giriş

Müasir dövrdə məktəblərdə əzbərçilikdən uzaq, müasir təlim metodlarından istifadə edilir. Bu metodlar şagirdlərdə bərpaedici və yaradıcı təxəyyülün inkişaf etdirilməsi məsələsinin zəruriliyini ön plana çıxardır.

Təxəyyül ali psixi funksiyalardan biri kimi diqqəti cəlb edir. İnsan təlim və əmək fəaliyyətində təkcə öz yaddaşına əsaslanmır. O, öz fəaliyyətinə yaradıcı şəkildə yanaşır, yaddaşında olan təsəvvürləri dəyişdirir, yeni qaydada birləşdirir, yeni surətlər yaradır və fəaliyyət göstərir. Yeninin yaradılması ilk əvvəl ideal şəkildə, fikirdə həyata keçirilir və sonra maddi, əməli şəkildə reallaşdırılır. İnsanın öz təsəvvürlərinin ideal şəkildə fikirdə birləşdirilməsi, dəyişdirilməsi və bu əsasda yeni surətlərin yaradılması təxəyyül prosesidir.

## Təxəyyül haqqında anlayış

Keçmiş qavrayış materiallarınının yenidən işlənməsi əsasında yeni sürətlərin yaradılmasından ibarət olan prosesə təxəyyül deyilir. Təxəyyül prosesində xarici aləmdə bilavasitə olmayan yeni surətlər yaradır. Lakin insan heç bir şeyi özündən uydurmur, yeni sürətlərin ayrı-ayrı əlamətlərini ancaq həyatdan götürür. Hətta ən fantastik surətlər belə insanların cisim və hadisələr haqqındakı təsəvvürləri əsasında formalaşmışdır. Bu təxəyyülün əsas xüsusiyyətidir. Təxəyyül surətlərinin keyfiyyəti insanın bilik və təcrübəsinin zəngin olmasından asılıdır. Onlar nə qədər zəngin olsa, təxəyyüldə yeni sürətlər yaratmaq üçün zəruri olan material da çox olar (1, s.98).

Bir çox psixoloqlar təxəyyülə müstəqil bir proses kimi qəbul edir. Lakin bəziləri təxəyyülü təfəkkürlə, bir qismi isə təsəvvürlə əlaqələndirir. Müstəqil bir proses kimi qəbul edilməsi daha məqsədə uyğundur. Çünki, təxəyyül obrazları təxəyyül və təfəkkür obrazlarından fərqlənir.

## Yaradıcı təxəyyülün inkişafı

Əgər bir uşağın yaradıcı olmasını istəyiriksə ilk əvvəl onda təxəyyülün inkişafına nail olmalıyıq. Məktəblilərə kiçik siniflərdən tədris olunan ədəbiyyat, ana dili, riyaziyyat, musiqi, rəsm, idman və s. kimi fənlərin köməkliyi ilə müəllim şagirdlərdə təxəyyülün aktivləşdirilməsi üçün müəyyən üsullardan istifadə etməlidir. Xəyali situasiyanın yaradılması, müəllim nağılı oxuyarkən uşaqların təsəvvüründə obrazların canlanması onlarda təxəyyülün aktivləşməsinə təkan verəcəkdir.

Məcazlar sistemi də insanın təxəyyülünün formalaşmasında mühüm rola malikdir. Bir insanın yaradıcılıq xüsusiyyətlərinə tək ortaya qoduğu işdə və ya başqaları ilə nitqində deyil, onun daxili nitqində də rast gəlmək olur. Nitq prosesi sayəsində insanın psixoloji vəziyyətini, onun yaradıcılıq imkanlarını, təxəyyülünün nə dərəcədə inkişaf etdiyini müəyyənləşdirmək olar. Məcazlar nitqimizdə monotonluğu aradan qaldırmaq, onun daha rəngarəng etməklə yanaşı insanın dünya və özü haqqında təsəvvürlərin formalaşmasına səbəb olur.

Psixologiyada 50-60 cı illərdə şəxsin yaradıcılıq imkanlarının müəyyən edilməsi üçün "Beyin həmləsi" metodundan istifadə edilirdi. Bu zaman kollektiv 5-10 nəfərlik qruplara bölünürdü və onlara hər hansı məsələ ilə bağlı öz ideyalarını irəli sürmək söylənilirdi. Təklif olunan ideyalar tənqid olunmamalı, və özündən əvvəlki ideyanı daha inkişaf etdirməli idi. Sonda isə ekspertlər ən yaxşı ideyanı seçməliyidilər. Bu metod bir çox ölkələrdə sınaqdan keçirilmişdir. Lakin, müasir metodların köməyi ilə yaradıcılıq və təxəyyül arasındakı qarşılıqlı əlaqəni, şəxsin yaradıclıq imkanlarını daha yaxşı şəkildə müəyyənləşdirmək mümkündür.

Müasir dövrdə "yarımçıq hekayə", "fiqurların identifikasiyası", "strukturların tutulması", "fiqurların kombinasiyası" kimi testlər, tapşırıqlarla yaradıcı təxəyyülün inkişaf səviyyəsini müəyyənləşdirmək olar.

Fəal yaradıcı təxəyyül birdən-birə yaranmır. Onda obrazlar mərhələlər üzrə yaranır. Öz xarakterik xüsusiyyətlərinə uyğun olaraq bu mərhələllər hazırlıq, təkmilləşmə, aydınlatma və yoxlama adlandırılan aşağıdakı ardıcıllıqla həyata keçirilir:

1. Hazırlıq mərhələsi- ideya üçün materialın yığılması;
2. Təkmilləşmə mərləsi- biliklərin konsentrasiyası, ideyaya yaxınlaşma, çatışmayan məlumatların əlavə olunması;
3. Aydınlatma mərhələsi- ideyanın intuitiv dərk edilməsi;
4. Yoxlama mərhələsi- son nəticənin dəqiqləşdirilməsi və formalaşdırılması (3, s.184).

İxtiraçılıq nəzəriyyəsinin müəllifi Q.S.Altşuller yaradıcı təxəyyülü beş mərhələyə ayırır:

1. Birinci mərhələdə qarşıya qoyulan məqsəddən asılı olaraq obyekt tamamilə dəyişdirilir. Obyektin dəyişdirilməsində əvvəlki elmi məlumatlardan istifadə etmək və lazım olarsa yeni elmi nəzəriyyələr yaratmaq mümkündür. Q.S.Altşuller qeyd etmişdir ki, bu mərhələdə təxəyyülün rolu minimumdur, yaradıcılıq isə reproduktiv xarakterə malikdir;
2. İkinci mərhələdə obyekt tamamilə dəyişdirilir. Məsələnin həlli az təsadüf edilən hadisə və effektlərin elmi əsasda araşdırılmasına əsasən tapılır;
3. Üçüncü mərhələ isə təkmilləşdirilən obyektin ciddi dəyişdirilməli olmağı ilə xarakterizə olunur. Burada tapşırılan işin yerinə yetirilməsi üçün yeni ideyalar və biliklər axtarmaq lazım gəlir. Təxəyyülün rolu birinci mərhələyə nisbətən daha böyükdür.
4. Dördüncü mərhələdə obyektin video dəyişikliklərinə ehtiyac yaranır. Bilik və vasitələrin ancaq bir istiqamətindən istifadə olunur.
5. Beşinci mərhələ obyektin dəyişməməsi ilə xarakterizə olunur. Bu zaman tətbiq etmə vasitəsi həmin obyektə yönəlir. Fikirdə yaranan obrazlar məlum variantlar üzərində qurulur. Təxəyyülün rolu maksimumdur.

Təxəyyül surətlərini təhlil edərkən şəxsiyyət amilini nəzərə almaq vacibdir. Şəxsiyyət keçmişin şüursuz meyillərinin və gələcəyə şüurlu canatmaların indiki zamanda ifadə vasitəsidir. Yaradıcılıq prosesində şəxsiyyətin özünü aktuallaşdırması, şəxsiyyətin özünü idarə etməsi, öz yaradıcılıq meyillərini həyata keçirə bilməsi amilləri xüsusilə diqqət mərkəzində saxlanılmalıdır.

Tədqiqatlar göstərir ki, “insanın əməliyyat aparmağı sürətlərin xassəsindən asılı olaraq onun təxəyyülü ya konkret, ya da mücərrəd səciyyə daşıyır” (4, s.208).

Hər yaş dövründə təxəyyül surətlərinin yaradılması fərqli xüsusiyyətlərə malikdir. Bunun üçün şagirdləri I-II, III-IV, V-VII, VIII-X1 sinif şagirlərinə ayrırıb hər birinin xarakteristikasından danışmaq olar.

Yuxarıda sadalanan xüsusiyyətləri şagirdlərə də aid etmək olar. 95 nömrəli məktəbdə olan müşüahidələrimə əsaslanaraq deyə bilərəm ki, yaradıcı şagirdlər digərlərindən bir sıra xüsusiyyətlərinə görə fərqlənir. Onlar daha həssas, xəyalpərəst, çoşqun, bəzən itaətkar, bəzənsə laqeyd ola bilirlər. Eyni zamanda həm aqressiv, həm də təmkinli olmağı bacarırlar. Bəzi yaradıcı şagirdlər isə çox sakit, təmkinli olmaları ilə fərqlənirlər.

Yaradıcı təxəyyülün xüsusiyyətlərinə uşaqda 3,4 yaşından rast gəlinir. Bəzi psixoloqlar uşaqlarda 9 yaşına qədər bərpaedici təxəyyülün mövcudluğunu, yaradıcı təxəyyülün isə 9 yaşından sonra formalaşması fikrini irəli sürüblər. Lakin kiçik yaşlarda olan uşaqların rəsmlərinə fikir versək, onları oyunlar zamanı müşahidə etsək belə nəticəyə gələrik ki, bu fikir yanlışdır.

6-7 yaşlı uşaqlarda yaradıcı təxəyyül daha yaxşı inkişaf etmiş olur. Təxəyyülün ikişafının aydın təzahürü nitqdə öz əksini tapır. Uşaqlar məktəbəqədər yaş dövründə nitqə yiyələnirlər. Nitqə yiyələnən zaman uşağın təsəvvüründə ətraf aləm haqqında daha aydın fikirlər formalaşır. Beləliklə, yaradıcı təxəyyülün inkişafı üçün zəmin yaranır.

Məktəbəqədər yaşlı uşaqlarda oyun fəaliyyəti mühüm rola malikdir. Rollu oyunların mənimsənilməsi uşaqlarda təxəyyülün inkişafına səbəb olan faktordur. Əgər uşaq 3- 4 yaşlarında daha çox oyuncaqlara maraq göstərirsə, 6-7 yaşlarında o daha çox təbbi əşyalarla-daş, qazan, daraq, çəkic və s. oynamağa həvəs göstərir.

Uşaqların adi söhbətlərinə fikir verin. Onlar özlərinin kövrək istək və arzularını həmişə gələcək zamanda ifadə edirlər və gələcək zamanda nə deyirlərsə, onların arzu-istək bildirən bu fikirlərində təxəyyülün bir parçası var. “Əmim gələcək, mənə nar gətirəcək”... — uşağın yuxu kimi şirin olan bu istəklərində onun təxəyyül aləmi bilavasitə əks olunur (3, s.106).

Uşaqların kiçik yaşlarında təxəyyül surətləri yaratması bəzən təsadüfü də ola bilər. Məsələn uşaq fikrini düzgün ifadə edə bilmədikdə, gerçək olmayan surətlər yaradır və ya hislərin təsiri ilə bir hadisəni şişirdilmiş formada danışır. Televiziya gördüyü hər hansı qoruxlu filmlər, eşitdiyi dəhşətli hekayələr onun təxəyyülünün mənfi cəhətdən inkişafına səbəb olur.

Məktəbyaşlı uşağın yaradıcılığına nəzər saldıqda bir sıra xüsusiyyətləri müşahidə edə bilirik. Artıq əsas fəaliyyət növü kimi oyun öz yerini təlimə verir. Yaradıcı təxəyyülün inkişafı təlimlə qarşılıqlı əlaqədə olur. Şagird artıq ətraf aləm, reallıq, cəmiyyət haqqında aydın təsəvvürlərə malik olur. Onda ixtiyari diqqət, hafizə, yaddasaxlama, yadasalma kimi əqli keyfiyyətlər formalaşır. Şübhəsiz ki, bunlar yaradıcılıq imkanlarının inkişafına səbəb olur. Bu yaş dövründə onun yaratdığı təxəyyül surətlər daha çox reallıqla bağlı olur.

Müəyyən edilmişdir ki, cisim və hadisələr arasındakı müxtəlif məna əlaqələrini görən, ayırd edən uşaqlar daha zəngin təxəyyül obrazları yaradırlar. Bu isə təsadüfi deyildir. Müasir təsəvvürlərə görə, təxəyyülü mənanın yaranması kontekstində öyrənmək lazımdır. Təxəyyül surəti özünün xüsusiyyətləri ilə, R.Bartın “Obrazın 125 ritorikası” əsərində göstərdiyi kimi, “mənanın əsl ontologiyasını” əks etdirir. Uşağın gerçəkliyə münasibəti bu mənalar vasitəsilə ifadə olunur (3, s.109).

I-II sinif şagirdlərinin yaradıcı təxəyyülü, məktəbəqədər yaş dövründə olduğu kimi, hələ konkret xasiyyət daşıyır. Bu, öz ifadəsini onda tapır ki, həmin sinif şagirdlərinin təxəyyülü hər hansı bir konkret cismə istinad etdikdə daha maraqlı surətlər yaranır. I-II sinif şagirdləri, məsələn, oyun oynayarkən, adətən müəyyən bir cisimdən istifadə edirlər. Müəyyən edilmişdi ki, konkret bir cisimdən istifadə etmədikdə onlar oyun zamanı vəzifələrini uzun müddət ifadə edə bilmirlər. Qabaqcıl müəllimlər bu cəhəti nəzərə alaraq I-II sinif şagirdlərinə, məsələn, baharda “Bahar” mövzusunda inşa yazdırmağı təklif edirlər.

III-IV sinif şagirdlərində yaradıcı təxəyyülün konkretliyi əsasən aradan qalxır. Onlar müəyyən bir konkret cismə istinad etmədən də, fəaliyyətin məqsədinə uyğun təxəyyül surətləri yarada bilirlər. Bu, görünür, onlarda mücərrəd təfəkkürün inkişaf etməyə başlaması ilə əlaqədardır (4, s.67).

Bu yaşda şagirdlərdə gərçəkliyə uyğun təxəyyül surətləri yaratmaq tələbatı yaranır. Belə olan halda, onların təxəyyül obrazları məhdudlaşır. Lakin bu məhdudlaşmanı mənfi hal kimi qiymətləndirmək düzgün deyildir. Belə ki, kiçik yaşlarında yaratdıqları reallıqdan uzaq olan təxəyyül surətləri artıq öz yerini real obrazlara verir.

Bu zaman müəllimin üzərinə düşən əsas vəzifə şagirdlərdə yaradıcı təxəyyülün inkişafına təsir göstərəcək təlim materiallarından istifadə etməkdir. Bu siniflərdə şagirdə verilən hekayədə əsas diqqət təbiətin təsvirinə, obrazların daxili aləminə, onların mənəvi dünyasına, hekayənin məzmununa yönəldilir ki, bu da yaradıcı təxəyyülün inkişafına müsbət təsir göstərir. Şagirdlər özləri də hekayələr, şeirlər yazırlar.

V-VII sinif şagirdlərinin təxəyyül surətləri öz xüsusiyyətlərinə görə digərlərindən fərqlənir. Şagirdlərin ədəbiyyat, rəsm və s. fənlərindən əldə etdikləri yeni biliklər onlarda bədii və təsviri fəaliyyət sahəsində yaradıcılıq imkanlarının inkişafına müsbət təsir göstərir.

Bu yaşda yaradıcı fəaliyyətdə əmələ gələn təxəyyül surətlərinin reallıq xüsusiyyətləri özünü daha aydın büruzə verir. Yeniyetmələr təxəyyül surətlərini yaradarkən məntiqə əsaslanır. Onlarda tənqiqi təfəkkür inkişaf edərək yaradıcı təxəyyülün müsbət təsir göstərir. Elə bu səbəbdən yeniyetmələrin nitqində, yazılarında reallıqdan uzaq nağıl sürətlərinə; divlərə, sehirli xalata, uçan xalçaya və s. rast gəlmək çətindir.

VIII- XI sinif şagirdlərində orijinal surətlər yaratmaq təlabatı yaranır. Onlar məşhur yazıçıların, rəssamların əsərlərində ilham alaraq bu surətləri yaratmağa səy göstərirlər. Bu yaşda tanış olduqları bədii təsvir və ifadə vasitələri, kimya, biologiya, fizika və başqa fənlərdə apardıqları eksperimentlər onlarda yaradıcılıq keyfiyyətlərinin inikişafına səbəb olur.

İlk gənclik dövründə yaradılan təxəyyül surətləri zamanı şagirdlər sürətlərin xarakteristikasına, onların hislərinə, ətraf aləmə, surətlərin özlərinə olan münasibətə xüsusi önəm verirlər. Şagirdlərdə müşahidəçilik, tənqidi təfəkkür kimi keyfiyyətlər inkişaf etmiş olur. Bu da özü-özlüyündə yaradıcı təxəyyülə öz müsbət təsirini göstərir.

Şagirdlərdə yaradıcı təxəyyülün inikişafına nail olmaq üçün bir çox metodlar, üsullar vardır. Müasir kurrikulumun əsas tələblərindən biri də şagirdlərin yaradıcılıq imkanlarının inkişafına nail olmaqdır. Bunun üçün bahalı texnikalara və ya labaratoriyalara ehtiyac yoxdur. Sadəcə dünyanın ən qabaqcıl ölkələrinin təcrübələrindən istifadə etmək kifayət edər.

Ə.Əlizadənin fikrincə, elmi-texniki tərəqqi şəraitində məktəb proqramının mənimsənilməsi ənənəvi təhsil sistemində olduğu kimi yaddaş gücünə yox, yalnız yaradıcı təfəkkür hesabına mümkündür. Başqa sözlə, hafizə məktəbindən- “əzbərləmədən” qurtulub, ağıl, hiss, və yaradıclıq məktəbinə keçid zəruridir (2, s.352).

Ç.M. Hacıyevin tədqiqatları onu deməyə imkan verir ki, yaradıcı ünsiyyətin təşkili probleminin işlənib hazırlanması yaradıcılığın kompleks tədqiqi strategiyasında ön sırada gələn məsələlərdən biridir. Yaradıcı ünsiyyəti Ç. M. Hacıyev 5 inkişaf mərhələsinə ayırır:

Birinci mərhələ— ünsiyyət daha çox kommunikativdir və informasiyanın ötürülməsindən ibarətdir;
İkinci mərhələ— ünsiyyət kommunikativdir, informasiya birbaşa təyinatı üzrə istifadə olunur;

Üçüncü mərhələ— ünsiyyət kommunikativ-yaradıcı xarakter daşıyır. İnformasiya həm təyinatı üzrə "birbaşa" həm də, sətiraltı mənada ifadə olunur;

Dördüncü mərhələ— ünsiyyət yaradıcı-kommunikativ xarakter alır. İnformasiyanın ötürülməsi özlüyündə köməkçi rol oynayır;

Beşinci mərhələ — bunu sırf yaradıcı mərhələ adlandırmaq olar. Ç. Hacıyevin fikrincə, yaradıcı ünsiyyəti təşkil etmənin bu mərhələyə uyğun real metodları hələ meydana gəlməyib (5, s.98).

Məktəbəqədər yaş dövründə uşağın əsas fəaliyyət növü oyundur. Oyunlardan istifadə edərək uşaqda təfəkkür və təxəyyülün inkişafına nail olmaq mümkündür. Oyunların müxtəlif növləri vardır; əşyavi və süjetli, hərəki və didaktik, fərdi və qrup halında, rollu və qaydalı oyunlar və s. Oyun – elə fəaliyyət növüdür ki, onun nəticəsində heç bir maddi və mənəvi məhsul əldə edilmir (yaşlıların və uşaqların işgüzar və quraşdırma oyunlarından başqa). Oyun ən çox əyləncə xarakteri daşıyır və istirahət məqsədi güdür. Lakin bu əyləncə vasitəsilə uşaqlar çox şey əldə edirlər. Onlar burada ünsiyyət tələbatların da ödəyirlər. Kiçik yaşlarında valideynlərlə oynadıqları oyunlar uşaqlar və valideynlər arasındakı münasibətə, ünsiyyətə təsir edir. O cümlədən bağça yaşı dövründə tərbiyəçilər uşaqların təfəkkür və təxəyyülünün inkişafına təkan verən oyunlardan istifadə etməlidir.

Təxəyyül və oyun bir-biri ilə sıx əlaqəyə malikdir. Məktəbəqədər yaş dövründə istər evdə ailə tərbiyəsi, istərsə də bağçada aparılan tərbiyə nəticəsində uşaqların oyun prosesində onların təsəvvür ehtiyatı xeyli artır, yaddaş fəaliyyəti, təfəkkürləri inkişaf edir, uşaqlarda yeni tələbatlar əmələ gəlir. Bütün bunlar isə onların təxəyyüllərinin geniş və məzmunlu xarakter alması ilə nəticələnir (6, s.327).

Bu yaş dövründə uşaqlarda özlərini kiməsə bənzətmək, digər insanların hərəkətlərini təkrarlamaq tələbatı yaranır. Elə bu səbəbdən onlar oyun oynayarkən müəllim, həkim, sürücü, pilot və s. rolunu öz üzərlərinə götürür, onların hərəkətlərini təqlid edirlər. Lakin təqlid etmə prosesi eyniylə olmur. Uşaq buraya öz fantaziyasına uyğun olaraq nələrsə əlavə edir. Oyunlarda yaradıcılıq ünsürləri öz əksini tapır.

Oyun zamanı uşaq şəraiti dəyişdirir, predmetləri yeni qaydada yerləşdirməyə can atır, əşyalara özü bildiyi funksiyaları həvalə edir. Kibrit qutusu-beşik, stul- avtomobilə, gəlinciklər- anaya, bacıya, uşağa çevrilir. Bu təxəyyülün yaradıcı funksiyası ilə əlaqədardır.

Şagirdlərin ilk qələm təcrübələrinə — rəsm əsərlərinə, şerlərinə, hekayələrinə, bəstələrinə, elmi-texniki axtarışlarına qayğı ilə yanaşılmalıdır. Onları bədii, elmi, texniki yaradıcılığın xüsusiyyətləri, görkəmli yazıçıların, alimlərin, konstruktorların və b. yaradıcılıq laboratoriyası ilə də tanış etmək, yaratdıqları yeni təxəyyül surətlərini ifadə etmək üçün yaradıcılıq vərdişləri aşılamaq lazımdır. Məktəbli xəyalının tərbiyə imkanlarından da səmərəli istifadə olunmalıdır (7, s.116).

Bir çox şagirdlər hər hansı problemin, məsələnin həllində təxəyyül imkanlarından yetərincə istifadə edə bilmirlər. Bunun səbəbi adətən təxəyyülün kasadlığı və zamanında valideyin və tərbiyəçi tərəfindən uşağın düzgün yönləndirilməməsi olur.

Bəs şagirdlərdə yaradıcı təxəyyülü necə aktivləşdirmək olar?—Müasir kurrikulumun tələblərindən biri şagirdlərlərə əməkdaşlığın, yoldaşlıq kollektivin üzvü olmaq hislərini aşılamaqdır. Buna görə də tədris zamanı qrup işlərinə xüsusi önəm verilir. Təcrübələr göstərir ki, qrupla iş zamanı şagirdlərdə yaradıcı təxəyyülün inkişafını stimullaşdıran mühit yaranır. Bunun üçün bir sıra metodlar vardır. Onlardan ən çox istifadə olunanların nəzərdən keçirək.

"Beyin həmləsi" — yaradıcısı A.Osbornun olmuşdur. O bu metodu 1957-ci ildə işləyib hazırlamışdır. Lakin müasir dövrdə də ondan geniş şəkildə istifadə olunur. Dərsdə 5-10 dəqiqə ərzində şagirdlərin öyrənilən mövzu, problemin həlli yolları üzrə müxtəlif ideyaları irəli sürməsi vasitəsi kimi istifadə olunur. Beyin həmləsi şagirdlərin yeni bilikləri üzə çıxarmağa, müzakirə olunan məsələyə maraq oyatmaqla yanaşı yaradıcı təxəyyülün inkişafında əvəzsiz rol oynayır. Bu zaman şagirdlər yeni fikir və ideyalar irəli sürməlidir. Bu isə öyrənilən mövzuya marağı oyadır.

Beyin həmləsi zamanı müəllim ilk olaraq həll olunmalı problemi elan edir. Sual lövhəyə yazıla və ya şifahi şəkildə verilə bilər. Mümkün qədər çox şagird fikir söyləməlidir. Söyləninlər heç bir şərh verilmədən, tənqidi münasibət bildirilmədən lövhədə qeyd olunur. Daha sonra ideyalar müzakirə edilir. Şagirdlər faydalı hesab etdikləri ideyaları seçirlər.

Klaster (şaxələndirmə)— Bu zaman müəllim tərəfndən lövhədə və ya iş vərəqlərində dairə çəkilir və onun mərkəzində yazılmış anlayış ilə bağlı söz və ya ifadələr söyləmək şagirdlərə tapşırılır. Müəllimin yazdığı anlayışdan başlayaraq hər onunla əlaqəli sözlər xətlərlə birləşdirilir. Bu zaman şagirlərdə həm yaradıcı həm də bərpaedici təxəyyül inkişaf edir. Şagird real olan və ya öz təxəyyülünün nəhsulu olan anlayışları qeyd edə bilər. Unutmaq olmaz ki, hər anlayış mərkəzdə yazılanla bağlı omalıdır.

Qərarlar ağacı— Bu üsul qərarların qəbul edilməsi zamanı alternativ yolları araşdırmaq və təhlil etmək məqsədi daşır. Şagirdlər təxəyyülərində məsələnin həlli yollarını canlandırmalı, onların hansının daha

səmərəli olduğuna qərar verməlidirlər. 4-6 nəfərdən ibarət qruplarda şagirdlər problemin həlli yollarının üstünlüklərini və mənfi cəhətlərini təhlil edir,onları "+", və ya "-" işarəsinin qarşısında müvafiq qaydada qeyd edirlər. Sonda nəticə cədvəlin qərar hissəsində yazılır və üstü örtülür. Bütün qrupların təqdimatından sonra müzakirə aparılır;

Qrup müzakirəsi metodlarından biri kimi U.Qardonun ―Sinektika‖ metodu da maraqlıdır. Öz dəst-xəttinə görə bu metod ―Beyin həmləsini‖ xatırladır, lakin ―Beyin həmləsindən fərqli olaraq ―Sinektika metodu müxtəlif ideyalar arasında oxşar cəhətlərin müəyyən edilməsini, ümumi məxrəcin tapılmasını nəzərdə tutur. Müzakirəni sinektor (qrup müzakirəsinin aparıcısı) başlayır. Onun əsas vəzifəsi bir-birinə əks ideyaları dəqiq formulə etməkdən ibarətdir. Qrup bu ideyaları müzakirə edib qiymətləndirir, onları bir-birinə yaxınlaşdıran ümumi cəhətləri müəyyən edir.

Sinektika metodunda məntiqi priyomlardan, xüsusilə oxşarlıq üzrə mühakimə priyomlarından geniş istifadə olunur (7, s.118).

Qrup işlərində istifadə olunan metodlardan başqa şagirdlərlə individual iş zamanı da onlarda yaradıcı təxəyyülün inkişafına səbəb olan müxtəlif üsullar vardır:

Layihələrin hazırlanması— Layihələrin hazırlanması müxtəlif mövzuların müstəqil şəkildə tədqiq edilməsidir. Layihələr şagirdlərin yaradıcılıq imkanlarının tədqiqat vərdişlərinin, biliklərə müstəqil yiyələnmə bacarıqlarının formalaşmasında mühüm rol oynayır. Müəllim tədqiqat zamanı şagirdə kömək edə, yol göstərə bilər. Lakin təqdimat zamanı şagird heç kimin köməyindən istifadə etməməmlidir. Tədqiqatın nəticəsi isə hesabat, xəritə, illüstrasiya, fotoşəkillər cədvəllər, qrafiklər, formasında ola bilər;

Şagirdlərin təxəyyüllünün inkişafı üçün psixoloqlar "yarımçıq hekayə" metodundan istifadəni məsləhət görürlər. Bu zaman şagird artıq hekayənin süjetini sadəcə olaraq inkişaf etdirmir həmçinin əvvəldən axıra qədər süjetin inkişafı üçün zəruri olan fərziyyələr irəli sürür. Əgər şagird yarımçıq hekayə metodunu uğurla yerinə yetirirsə, belə nəticəyə gəlmək olar ki onda yaradıcı təxəyyülün inkişafı normal səviyyədədir;

Bunlardan başqa şagirdlərə şeir yazmaq, möcud olmayan bir əşya və ya heyvan şəkli çəkmək, sadə bir qutunu öz istəklərinə uyğun bəzəmək, verilmiş müxtəlif fiqurlardan müəyyən əşya düzəltmək və s. kimi əyləncəli tapşırıqlar verilə billər. Bu tipli tapşırıları şagirdlər sevərək yerinə yetirəcək, müəllim isə onlarda yaradıcı təxəyyülün inkişafını stimullaşdıracaqdır.



Şəkil 2. Torrans "Təxəyyülün diaqnostikası"

**Ədəbiyyat:**

1. Əzizov Q.Q. "Psixologiya" Bakı: 2013, 432 s.
2. R.H. Qədirova T.T. Babayeva Ümumi psixologiyadan ixtisas praktikumu, Bakı:2014, s.169.

3. Salamova K. B. Ümumi psixologiya Sumqayıt: 2016, 380 s.
4. Y. V. Şoroxova, İ. P. Pavlovun siqnal sistemləri haqqında materialist təlimi, Moskva,1955-ci il, 208 s.
5. Пономарев Я.А., Гаджиев Ч.М. Закономерности общения в творческом коллективе. Психология творчества: общая, дифференциальная, прикладная.М. Найка, 1990. 303 с .
6. Bayramov Ə.S., Əlizadə Ə.Ə. Psixologiya. Ali məktəblər üçün dərslik, Bakı: Çinar–çap, 2002, 623 s.
7. Psychobox. A box of psychological games. UK, 2004

**Progress and Bringing up of Students' Creative İmagination**
**Summary**

This article is based on the number of local and foreign psychologists' experimental-psychological investigations and academic researches. Creative imagination differs according to its age groups and students' individual characters. The most efficient way of achieving the progression of creative imagination, is choosing appropriate method for each age group. Experimental tests are also important for measuring the effectiveness of imagination. Children who can identify different content connection are able to create more creative images. Imagination has significance role in all type of activities.

**Развитие и воспитание творческого воображения у студентов**
**Резюме**

Эта статья основана на экспериментальных и психологических исследованиях азербайджанских и зарубежных психологов. Творческое воображение образовывается в зависимости от возрастной группы и индивидуальных особенностей учащихся. Самый эффективный способ достичь творческого воображения - это выбрать метод, подходящий для каждой возрастной группы. Экспериментальные тесты также важны для измерения эффективности воображения. Дети, которые видят разные значения между предметами и событиями, создают более лучшее воображение и видят новые образы. Воображение важно во всех сферах деятельности.

**Rəyçi: f.ü.f.d. Ə.Əliyev**

**Мамедова Егана Исраиль гызы**
Азербайджанский государственный
университет нефти и промышленности
yenana@mail.ru

# ПРИМЕРЫ ПРИМЕНЕНИЯ ИННОВАЦИОННЫХ ТЕХНОЛОГИЙ В ПРЕПОДАВАНИИ ИНОСТРАННОГО ЯЗЫКА

***Ключевые** слова: русский язык как иностранный, методика обучения русскому языку как иностранному, языковая личность, типология ошибок, формы и методы контроля*
***Acar sözlər**: rus dilini xarici dil kimi, xarici dil kimi rus dilinin tədrisi üsulları, dil şəxsiyyəti, səhvlərin tipologiyası, idarəetmə formaları və metodları*
***Key word**: russian as a foreign language, methods of teaching Russian as a foreign language, language personality, typology of errors, forms and methods of control*

Инновации становятся определяющей характеристикой преподавания иностранному языку за последние годы. Сегодня интеграция технологий в обучении иностранному языку неизбежно, поэтому значительное внимание уделяют внедрению инновационных технологий в образовательный процесс. Современный этап развития общества ставит перед системой образования целый ряд принципиально новых проблем, среди которых следует отметить необходимость повышения качества и доступности образования. Принципы – это исходные положения, лежащие в основе учебного процесса, правила, которых должен придерживаться преподаватель в работе с учащимися. Эффективность обучения в целом и достижение поставленных целей на отдельном занятии зависит от знания и осуществления основных принципов преподавания русского языка и организации урока. Планируя занятие с иностранными учащимися, преподаватель должен учитывать следующие ведущие принципы:

1.Коммуникативное обучение (единица обучения – речевой акт). Вырабатывается речевое поведение в различных социальных ситуациях, поведение определяется социальным контекстом.

2. Формирование коммуникативной компетенции, т.е. умения решать коммуникативные задачи речевыми средствами. В процессе обучения используются аутентичные материалы, вводятся страноведческие понятия. Коммуникация ведется на изучаемом языке.

3.Личностно-деятельностный подход. В процессе обучения устанавливается межличностное общение: учащиеся решают общие задачи, работают в парах, группах и т.п., преподаватель создает условия коммуникации и облегчает ее.

4. Использование речевой ситуации в процессе обучения. В процессе обучения различают два вида ситуаций: естественные ситуации имеют естественные стимулы к речи (опоздание на урок, пропуск занятий, решение внеучебных вопросов и т.п.); учебные ситуации обеспечивают планомерную работу по развитию навыков речи на основе различного лексико-грамматического материала. Компоненты речевой ситуации: условия ситуации: описание обстановки и информация об участниках – речевой стимул (причина, побуждающая к речи) – речевая реакция.

Помимо основных принципов организации занятия по русскому языку как иностранному, современная методика преподавания РКИ предлагает модель уроков. Модель урока определяется задачей, которую ставит 7 преподаватель перед учащимися. Тем не менее, существует традиционная структура урока.

1. Начало урока. Как правило, начало урока представляет собой личностное общение, ответы на вопросы (Как дела? Что вы делали вчера? и т.п.), преподаватель стимулирует речевую деятельность учащихся. Оргмомент.

2. Аудирование (рассказ преподавателя на основе личных впечатлений или прочитанного, заранее подготовленного текста). 3. Основная часть урока. Введение нового материала с помощью текста – работа с новыми лексическими и грамматическими единицами – выполнение упражнений разных видов для формирования языковой, речевой и коммуникативной компетенций – обучение чтению и письму – подведение итогов урока.

Данная модель может быть представлена в виде более подробной схемы:

1. Организация начала урока (введение в языковую среду).
2. Проверка домашнего задания.
3. Подготовка к активной учебно-познавательной деятельности на основном этапе урока.

4. Введение нового учебного материала и алгоритма формирования новых речевых умений и навыков.

5. Первичная проверка понимания учащимися нового учебного материала.

6. Закрепление новых языковых и речевых умений и навыков.

7. Обобщение и систематизация учебного материала.

8. Контроль и проверка языковых и речевых умений и навыков.

9. Подведение итогов урока.

10. Домашнее задание. В специальных целях структура урока может меняться. В данном учебном пособии предложенные уроки направлены на развитие навыков чтения, аудирования и говорения, в связи с чем предлагается следующая модель урока: словарь, речевые модели, диалог, вопросы на понимание текста, задание и тесты. Каждый компонент урока предполагает использование различных видов упражнений, развивающих разные виды речевой деятельности (РД) и формирующих разные компетенции. Как видим, выполнение упражнений не является самоцелью, различные типы упражнений направлены на развитие видов речевой деятельности и запланированы преподавателем. Речевая деятельность – это один из видов деятельности человека, понимаемый методистами как «активный, целенаправленный, опосредованный языковой системой и обусловленный ситуацией общения процесс передачи и приема сообщения» [21]. Речевая 8 деятельность представляет собой систему умений, направленную на решение коммуникативных задач. Если в процессе речевой деятельности информация порождается и передается, то такой вид речевой деятельности носит продуктивный характер. Если речевая деятельность ориентирована на восприятие и переработку информации, то ее характер рецептивный. К продуктивным видам речевой деятельности относятся говорение и письменная речь, к рецептивным – аудирование и чтение.

Помимо развития определенных видов речевой деятельности, структура урока и используемые преподавателем типы упражнений связаны с формированием компетенций у учащихся. В современной науке существуют разные подходы к определению данного понятия, но в практическом аспекте компетенции описывают, во-первых, чем необходимо овладеть изучающему иностранный язык, чтобы использовать его в целях общения; во-вторых, какие знания и умения необходимо освоить, чтобы коммуникация была успешной. В связи с этим при изучении языка различают три вида компетенций: 1) языковая компетенция предполагает понимание и знание языка, то есть знание системы языка и его подсистем – фонетики, лексики, грамматики; 2) речевая компетенция – это навыки и умения строить речь по правилам; 3) коммуникативная компетенция – навыки и умения использовать язык в целях общения, создавая грамотные речевые произведения. С данным видом компетенций тесно связаны коммуникативные умения, то есть умения решать неречевые задачи речевыми средствами.

Новые технологии обучения помогают создавать мотивирующую благоприятную среду в процессе урока. Инновационная деятельность ориентирует педагога на будущее, на новейшие достижения науки, а инновационно работающие образовательные учреждения приобретают конкурентные преимущества и тем самым опережают в своем развитии другие структурные элементы системы образования. Значит, инновационная деятельность предполагает положительные преобразования образовательной системы и нацелена на развитие самого педагога как творческой личности.

В обучении иноязычнои речи используются интерактивные методы. В этом процессе суггестологический метод приобрел особую эффективность. Использование оптимальных средств во время аудиторной работы создает возможности для интенсивного усвоения речи в коммуникативном общении, мотивирует процесс обучения. Современную методику преподавания русского языка как иностранного характеризует акселерация, т.е. ускорение темпов обучения, стремление к большой оптимизации, интенсификации учебного процесса. Для более совершенного практического овладения иностранным языком необходимо в известных пределах понимать устную и письменную речь на данном языке и уметь выражать свои мнения на нем. Из этого следует простой вывод, что в типичном случае предметом обучения должен быть не русский язык вообще, а речь на русском языке, процессы порождения речи. Различие между языком и речью с наибольшей очевидностью выступает как раз при обучении иностранному языку, в процессе чего, с одной стороны, изучается язык, т.е. происходит овладение теорией языка, с другой - научение речи, т.е. научение говорению, слушанию, чтению и письму. В результате изучения языка приобретаются знания, в результате практики - умения и навыки. Умение общаться на иностранном языке представляет собой моделирование ими в речевой практике процессов порождения, смыслового восприятия и комму ни кативного

взаимодействия речевых высказываний и формирование соответствующих механизмов. Особое значение приобретают овладение обучаемыми психотехникой речевого общения и достижение в обучении ряда педагогических целей. Это особым образом организованное обучающее общение, в ходе которого происходит ускоренное познавательное обогащение и активное творческое развитие личности при помощи системы управляемых групповых взаимодействий. Здесь главной целью обучения выдвинуто овладение учащимися иноязычной речью.

Известно, что иностранцы, изучающие русский язык у себя на Родине, оказываются бессильными, попадая в нашу страну. Они не могут применить полученные знания. Поэтому особое значение придается языковой среде, где происходит приобретение практических навыков речевого общения.

**Литература:**

1. Китайгородская Г.А. Методика интенсивного обучения иностранным языкам/Г.А. Китайгородская. - М.: Высшая школа, 1991.
2. Митрофанова О.Д. Методика преподавания русского языка как иностранного / О.Д.Митрофанова, В.Г. Костомаров. - М.: Русский язык, 1990.
3. Маркова И.Н. Интерактивные методы обучения русскому языку иностранных студентов. Педагогика. Научное образование, МГТУ.2001
4.Русская разговорная речь. Фонетика. Морфология, Журналистика.2008 № 2

**Xarici dil tədrisində innovativ texnologiyaların tətbiqi nümunələri**
**Xülasə**

Məqalədə rus dilinin tədrisinin müasir metodları müzakirə olunur. Həm dil materialının məzmununa, həm də texnologiyaların düzgün seçilməsinə, effektiv tədris metodlarına və xarici dilli qruplarda rus dilinin biliklərinə nəzarət etmək üçün innovativ bir yanaşmanın zəruriliyi vurğulanmışdır.

Təhsil prosesində vacib bir komponent tələbənin aktiv işinin əsas motivi olan bilişsel maraqdır. Mövzuya maraq, materialı daha yaxşı başa düşməyə kömək edir. Bu gün təlimin əsas vəzifəsi yalnız müəyyən bilik və bacarıqların ötürülməsi deyil, həm də tələbənin şəxsi və peşə baxımından əhəmiyyətli keyfiyyətlərinin formalaşdırılmasıdır. Bu problem müəllim fəaliyyətindən tələbə fəaliyyətinə vurğu edərək, tədrisə innovativ yanaşmalarla həll olunur.

**Examples of the application of innovative technologies in teaching a foreign language**
**Summary**

The article discusses modern methods of teaching the Russian language. The necessity of an innovative approach both to the content of the language material and to the right choice of technologies, effective teaching methods, and control of knowledge of the Russian language in foreign-language groups is emphasized.

An important component in the educational process is cognitive interest, which is the fundamental motivation for the student's active work. Interest in the subject helps to better understand the material. Today, the main task of training is not only the transfer of certain knowledge and skills, but also the formation of the student's personal and professionally significant qualities. This problem is solved by innovative approaches to teaching, shifting the emphasis from teacher activity to student activity.

**Рецензент: доц.С.Алиева**

**Aslanova Ülviyyə Salam qızı**
Bakı ş., 170 № -li tam orta məktəb

# AZƏRBAYCAN DİLİNİN TƏDRİSİNDƏ OXU TƏLİMİNƏ VERİLƏN TƏLƏBLƏR

***Açar sözlər:*** *İbtidai təhsil, Azərbaycan dili, oxu təlimi, nitq mədəniyyəti, metodika*
***Key words:*** *Primary education, Azerbaijani language, readings, speech culture, methodology*
***Ключевые слова:*** *Начальное образование, Азербайджанский язык, чтения, речевая культура, методика*

Azərbaycan dilinin tədrisində əsas məqsəd şagirdlərin nitq bacarıq və qabiliyyətlərini təkmilləşdirmək, ana dilində düzgün yazı, oxu və nitq mədəniyyətinə yiyələndirməkdir. Bütün bunlarla bərabər dilin tədrisi şagirdlərin elmi dünyagörüşünü genişləndirir, təfəkkürünü inkişaf etdirir, leksikonunu zənginləşdirir, düzgün nitq vərdişləri, danışıq qabiliyyəti yaradır, onlarda ana dilinə sevgi və məhəbbət hissləri aşılayır və mənəvi, əxlaqi cəhətdən onları kamilləşdirir.

Bu cəhətdən Azərbaycan dilinin tədrisində oxu materialları və onların öyrənilməsi və öyrədilməsi məsələləri xüsusi yer tutur. Oxudan səmərəli istifadə etmək, oxunun düzgün metodikasına yiyələnmək - xüsusilə ifadəli oxu qaydalarına əməl etmək, şagirdlərin düzgün, savadlı nitqə yiyələnmələrinə, əxlaq vəmənəviyaytlarının zənginləşməsinə, yaradıcı təfəkkürlərinin inkişafına və gələcəkdə də onların natiqlik qabiliyyətlərinə yiyələnmələrinə səbəb olacaqdır.

Oxu şagirdlərin dil duyumunun inkişafını, fikrin ifadə olunmasında sözün məna xüsusiyyətlərinin, cümlə və mətnin rolunun anlaşılmasını, lazımi vərdişlərin məqsədyönlü şəkildə təkmilləşdirilməsini, dilin gözəlliyinə, üslubi imkanlarının zənginliyinə şagirdlərin maraq və məhəbbətinin formalaşmasını təmin edir. Müxtəlif üslublarda yazılmış mətnlərin məzmun və struktur elementlərinin müstəqil qavranılmasına imkan yaradır, ana dilinə, bu dildə yazılmış elmi-kütləvi və ədəbi-bədii nümunələrə marağı dərinləşdirməyə, ümumi nitq mədəniyyətinin inkişafı üçün lüğət ehtiyatını daha da zənginləşdirməyə xidmət edir.

Oxu dərsləri şagirdlərin nitqini, təfəkkürünü, təxəyyülünü, fantaziyasını, yaradıcılığını inkişaf etdirməklə yanaşı onlarda yüksək müsbət əxlaqi, mənəvi keyfiyyətlər formalşdırır. Professor Yəhya Kərimov bu barədə çox dəyərli fikirlər söyləyir: "Oxu dərslərində şagirdlərdə vətənə məhəbbət və səadqət tərbiyə olunur, onlara xeyirxahlıq, ədalətlilik, namusluluq, mərdlik, fədakarlıq, təvazokarlqı, düzlük və doğruçuluq kimi sosial-əxlaqi keyfiyyətlər aşılanır, onların dünyagörüşünün formalaşması üçün ilkin bünövrə qoyulur"(1,178).

Oxu şagirdlərin fikirlərini şifahi və yazılı şəkildə ifadə etmək bacarığını yüksəldir, onlarda şüurlu, düzgün, sürətli və ifadəli şəkildə oxunmuş materialın məzmununu nəql etmək və s. bacarıqlar yaradır. Bütün bunlarla yanaşı, oxu şagirdlərin nitqini inkişaf etdirir, onların lüğət ehtiyatını zənginləşdirir, dəqiqləşdirir. Professor Nabat Cəfərova bu barədə yazır: "Oxu məşğələləri şagirdlərin lüğət ehtiyatlarını zənginləşdirmək baxımından çox mühüm və zəruri mənbədir. Oxu dərslərində lüğət üzrə iş əsasən yeni sözlərin şagirdlərin fəal lüğət ehtiyatına daxil edilməsi, nitqin sinonimlər, omonimlər, çoxmənalı sözlər, antonimlər, obrazlı söz və ifadələr hesabına zənginləşdirilməsi şəklində aparılmalıdır"(2, 298 )

Hər bir təhsil səviyyəsi üzrə oxunun tələbləri dəyişir. İbtidai təhsil səviyyəsində mətnin oxununşunda aşağıdakı tələblərə əməl edilməlidir: Şagirdlər üçün:

• mətni düzgün və şüurlu oxuyur;
• mətni ifadəli oxuyur;
• müxtəlif mətnləri bütöv sözlərlə səsli və səssiz oxuyur;
• oxuduğu mətnin məzmununu anlayır, emosional hisslər keçirir və ona fəal münasibət bildirir;
•mətnin hissələri arasında məntiqi və məna əlaqələrini müəyyənləşdirir;
•bədii və elmi – kütləvi mətnləri fərqləndirir.

Oxunun düzgünlüyü dedikdə sözlərin aydın səlis tələffüzü, yəni təhrif etmədən, heca və səsləri buraxmadan, əlavə etmədən, onların yerini dəyişmədən, sözün sonunu təhrif etmədən oxunması, sözlərdə vurğunu düzgün işlətmək və vurğuya görə sözün, mənasının dəyişməsinə yol verməmək, cümələlərin sonunda fasilə verməklə oxumaq, durğu işarələrinin tələblərinə əməl etmək, cümlədə söz buraxmamaq və əlavə etməmək, cümlədə sözləri və mətndə cümlələri təkrarlamamaq, kəkələməmək, dialektdən istifadə etməmək başa düşülməlidir. Aydın məsələdir ki, ibtidai siniflərdə şagirdlərin cümlənin məqsəd və intonasiyaya görə növləri barədə anlayışları vardır. Mətnin düzgün oxunuşunda intonasiya xüsusi əhəmiyət kəsb edir, durğu işarələri, vurğu, pauza və s. oxu qaydalarına ciddi əməl edilməldiir.

Əlbəttə, oxunun şüurluluğu da əsas şərtdir. Şüurluluq hər bir sözün, söz birləşməsinin, cümlənin və bütövlükdə mətnin mənasının başa düşülməsində özünü göstərir. Oxunun şüurluluğu oxunmuş mətnin məzmununun şagirdlər tərəfindən mənimsənilməsini tələb edir. Şüurlu oxu təlim nəticəsində şagird mövzunun məzmunu əsasında hekayənin əsas fikrini izah etməli, onun məzmununu yaşamalı, əsas obrazın davranışlarına münasibət bildirməli, əsərin, hekayənin və yaxud parçanın ideyasını başa düşməli, əsərin məzmununu başa düşməklə onu qiymətləndirməlidir.

Oxunun mühüm keyfiyyətlərindən biri mətnin ifadəli oxunuşudur. İfadəli oxu həm şeirlərin, həm də hekayələrin, daha başqa janrların oxunuşunda da vaciblidir. Oxunun ifadəliliyi həm qavramanı, həm anlamanı dərinləşdirir, həm də hiss və emosiyaların, təxəyyülün inkişafına, estetik zövqün formalaşmasına müsbət təsir göstərir. Belə, ki şagirdlər bədii mətni oxuyarkən uşaqların ixtiyari, məqsədyönlü diqqəti nəticəsində fikirlər cəmləşir, mətnin məzmunu obrazlar vasitəsilə aydınlaşır və şagirdlərdə müxtəlif hiss və emoisiyalar, təəssüratlar yaranır.İfadəli oxu zamanı şagird oxuduğu mətni anlamalı, dərk etməli və onu təsvir etməyi, danışmağı bacarmalıdır.

Şagirdlərin səsli və səssiz oxumasının özünəməxsus üstünlükləri vardır. Səsli oxu şagirdin nitqini, tələffüzünü inkişaf etdirdiyi kimi, səssiz oxu şagirdin sürətli oxumasına imkan yaradır. İbtidai təhsil səviyyəsi üzrə kurikulumda təlim nəticələrində qeyd olunan meyarlarda deyilir: "Şagird mətni düzgün, sürətli, ifadəli, şüurlu oxuyur"(3, 34). Deməli, istər səsli, istərsə də səssiz oxuda kurikulumun tələblərinə cavab verməlidir.

Oxu zamanı ən mühüm tələblərdən biri mətndəki sevinci, kədəri, həyəcanı, təəssüfü, heyrəti və sair emosional hissləri şagirdlərə çatdırmaq, hadisələrə münasibət bildirməkdir. Tanış olmayan, mürəkkəb məzmunlu mətni ifadəli oxumaq bəzən çətinlik törədir. Bu zaman mətni əlbəttə təkrar oxumaq da lazım olacaqdır ki, hər sözün, hər ifadənin daşıdığı mənanı anlamaq, təsvir olunan hadisələri sanki özününkü kimi yaşamaq xəyallarında canlandırmaq, qəhrəmanlar sevinirsə sevinmək, kədərlənirsə kədərlənmək lazımdır.

Oxu dərslərində müəllim şagirdlərin məntiqi və tənqidi təfəkkürünün inkişaf etdirilməsi üzrə xüsusi iş aparmalıdır. Belə ki, bu zaman müəllim mətndə məntiqi əlaqələrin tapılması, əşya və hadisələrin, insan tiplərinin müqayisəsi, oxşarlığı və fərqli xüsusiyyətlərini şagirdlərlə birlikdə təhlil etməli və onların təsnifatını aparması, tutuşdurması, ümumiləşdirməsi kimi təlim metod və priyomlarından istifadə etməlidir.

Oxu təliminin qarşısında duran ən mühüm məsələlərdən biri də uşaqlarda ətraf aləm haqqında, insanlar, peşələr, heyvanlar, quşlar, təbiət hadisələri haqqında düzgün və obrazlı təsəvvürlərin yaradılmasıdır.

Bu baxımdan oxu təlimi prosesində şagirdlərdə elmi-kütləvi ədəbiyyatın da oxunmasına maraq oyatmaq lazımdır. Çünki elmi-kütləvi ədəbiyyatın oxunması şagirdlərin idrak qabiliyyətini inkişaf etdirir, zehni fəallığını artırır. Şagirdlərdə fikir mübadiləsi aparmaq, öz mülahizələrini söyləmək kimi qabiliyyətləri inkişaf etdirir.

Bəs oxunun sürəti necə olmalıdır? Məlum məsələdir ki, hər bir şagird üçün orta oxu sürəti vardır. Bu oxu sürəti tələb olunan normaya uyğunlaşdırılmalıdır. Şagird eyni vaxtda bir-neçə sözü, söz birləşməsini, cümləni görmə vərdişinə yiyələndikdən sonra oxunun normal sürətinə nail olmaq olar.

Şagirdlərin oxu sürəti tələffüz orqanlarının düzgün və sərbəst işindən asılıdır. Təcrübələrdən məlum olur ki, ibtidai siniflərdə sürətli oxuya alışan şagirdlər yuxarı siniflərdə daha yaxşı oxuyurlar. İbtidai siniflərdə şagirdlər 1 dəqiqədə 120- 150 söz oxumağı bacarmalıdırlar. Müəllim oxu sürətini təmin etmək üçün mətni təkrar oxuda bilər və ya dildönmələrdən, yanıltmaclardan, yaxud da dialoji, cütlərlə oxulardan istifadə edə bilərlər. Mətnin hissələrlə oxunması da oxu sürətini artırmağa kömək edər. Saniyəölçənlə oxu sürətini ölçməklə şagirdləri tədricən sürətli oxu vərdişlərinə də alışdırmaq lazımdır. Çox oxuyan şagirdlər daha sürətli oxuyurlar.

Beləliklə, oxu dərsləri elə qurulmalıdır ki, bu dərslərdə təlimə verilən pedaqoji tələb kimi şagirdlərin təhsili, tərbiyəsi və inkişafı vəzifələri vəhdətdə yerinə yetirilsin. Səriştəli, peşəkar müəllim oxunun bütün parametrlərinə dəqiq riayət etməlidir. Professor Rüfət Hüseynzadə qeyd edir ki, səriştəli müəllim özü də mətni düzgün, ifadəli oxumalı, ədəbi dildə danışmalı, natiqlik qabiliyyətinə malik olmalı, düzgün və gözəl yazmalı, şagirdlərlə düzgün ünsiyyət və münsasibətdə olmalıdır (4,175).

Bütün bunlardan belə nəticəyə gəlmək olar ki, düzgün oxu bacarıqlarına yiyələnmək şagirdin gələcək hərtərəfli inkişafı, gözəl nitqi, təfəkkürü, məntiqi, lakonik danışığı, məzmunlu söhbəti, ümumi savad göstəricisi üçün əsas amildir.

**Ədəbiyyat:**

1. Kərimov Y.Ş. İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası. (Dərslik). Bakı:Səda, 2013, 552 s.
2. Cəfərova N.B. İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası. Dərslik. Bakı: ADPU, 2016, 403 s.
3. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008, 480 s.
4. Hüseynzadə R.L. Pedaqoqika. Dərslik. 2 cilddə. II cild. Bakı: Mütərcim, 2013. 540 s.

**Reading requirements for teaching the Azerbaijani language**
**Summary**

One of the most important tasks of elementary school is the formation of children's reading skills, which is the foundation of all subsequent education. Formed reading skill includes at least two main components: a) reading technique (correct and quick perception and scoring of words based on the connection between their visual images, on the one hand, and acoustic and speech-motor, on the other); b) understanding of the text (extracting its meaning, content). Usually the formation of this skill is delayed for many years. The primary school program provides for its gradual improvement from class to class, and at each stage, its formation is evaluated by such indicators as speed (fluency) of reading, its correctness, meaningfulness and expressiveness. It can be argued that reading skills are formed at the primer level. Further, the reading skill is developed and improved.

**Требования к чтению при обучении азербайджанскому языку**
**Резюме**

Одна из важнейших задач начальной школы – формирование у детей навыка чтения, являющегося фундаментом всего последующего образования. Сформированный навык чтения включает в себя как минимум два основных компонента:

а) технику чтения (правильное и быстрое восприятие и озвучивание слов, основанное на связи между их зрительными образами, с одной стороны, и акустическими и речедвигательными, – с другой); б) понимание текста (извлечение его смысла, содержания). Обычно формирование этого навыка затягивается на долгие годы. Программа начальной школы предусматривает его постепенное усовершенствование от класса к классу, и на каждом этапе его сформированность оценивается по таким показателям, как скорость (беглость) чтения, его правильность, осмысленность и выразительность. Можно утверждать, что навык чтения формируется на уровне букваря. Далее навык чтения развивается и усовершенствуется.

**Rəyçi: prof.R.L.Hüseynzadə**

## SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУССТВОВЕДЕНИЕ

**Salamova Aysel Aydın qızı**
Azərbaycan Milli İncəsənət Muzeyi
salamova1991@inbox.ru

# AZƏRBAYCAN MİLLİ İNCƏSƏNƏT MUZEYİNİN TOPLUSUNDA ALEKSANDR İSAAKOVİÇ XARŞAKIN QRAFİK ƏSƏRLƏRİ

***Açar sözlər:*** *hərb mövzusu, faşizm, qrafik incəsənət, ofort, muzey, sərgi*
***Key words:*** *military subjects, fascism, graphic work, etching, museum, exhibition*
***Ключевые слова:*** *военная тематика, фашизм, графическое произведение, офорт, музей, выставка*

Qrafika təsviri sənətin bir növüdür və əsrlər boyu rəssamlar qrafikanın müxtəlif üslub və teknikalarına müraciət edərək dünya incəsənətinə əvəssiz əsərlər bəxş etmişlər. İşlənmə texnikasına görə qrafika sənəti iki hissəyə ayrılır – rəsm və çap qrafikası. Rəsm qrafikası ən qədim növlərdən sayılır ki, kağız və ya parça üzərində karandaş, sulu boya, pastel, quaş, tuş, tempera ilə çəkilən əsərlərə deyilir. Çap qrafikası isə nisbətən daha mürəkkəb işlənmə texnikasına (ofort, ksiloqrafiya, litoqrafiya, linoqravür və s.) malikdir. Bu texnikalarda yaradılan əsərlərin bir deyil bir neçə nüsxəsi hazırlanır.



**Şəkil 1. Aleksandr İsaakoviç Xarşak (1908-1989)**

Yuxarıda qeyd etdiyimiz təsviri sənətin qrafika növünün ofort texnikası metal, yəni mis üzərində iynə ilə cızılmış və sonra basma üsulu ilə yaranmış qravürlərə deyilir. Bu texnikaya bir çox rəssamlar müraciət etmişdir ki, bunlar arasında dünya rəssamlıq sənətinə əvəzolunmaz ofortlar bəxş edən görkəmli rus rəssamlarından biri Aleksandr İsaakoviç Xarşakın (1908-1989) yaradıcılığına aid olan bir sıra əsərləri qeyd etmək tam yerinə düşər. Onun ofort texnikasında yaratdığı silsilə işləri daha çox diqqət mərkəzindədir. (şəkil 1)

Əməkdar rəssam Xarşak Aleksandr İsaakoviç 21 yanvar 1908-ci ildə Novqorod - şimali Çerniqov quberniyasında anadan olub. Gənc rəssam atasının ölümündən sonra Petroqroda köçür və burada təhsil aldığı müddətdə rəssamlığa maraq göstərməyə başlayır. A.İ.Xarşak ilk rəssamlıq təhsilini 1925-1929-cu illərdə Bədii – Sənaye Texnikumunun Qrafika bölməsində alır. Təhsil aldığı müddətdə gənc rəssama bir çox tanınmış rəssamlar dərs keçmişdir ki, onlardan V.P.Levitskinin adını çəkmək olar. Texnikumu bitirdikdən sonra məhz çalışqanlığına və sənətə olan böyük həvəsinə görə A.Xarşak "Qırmızı qəzet" redaksiyasında bədii redaktor vəzifəsinə təyin edilir. [2; 3]

A.Xarşak sonralar Ümumrusiya Rəssamlıq Akademiyasının rəngkarlıq, heykəltəraşlıq və memarlıq institutunun qrafika emalatxanasında ali təhsil alır. Burada təhsil aldığı müddətdə o, rəngkarlığı və qrafikanın ofort texnikasını daha dərindən öyrənir və gününün çox hissəsini emalatxanada keçirdir. Bu zaman emalatxananın rəhbəri Pavel Aleksandroviç Şilinqovskiy, müəllimləri isə Konstantin İvanoviç Rudakov, İvan Yakovleviç Bilibin və Nikolay Aleksandroviç Pavlov olmuşdur. Onlarla tanışlıq rəssamın gələcək yaradıcılığında nəaliyyətlər qazanmasına böyük təkan vermişdir. [2; 3]

1941-ci ildə orduya qoşulmamışdan qabaq gənc rəssam sulu boya texnikasında, diplom qabağı bir sıra eskizlər edir və bu eskizlər yüksək qiymətləndirilir. İkinci dünya müharibəsinin başlanması ilə əlaqədar olaraq A.İ.Xarşak diplom müdafiəsini yarımçıq qoyur. Pulkovo uğrunda gedən döyüşlərə qoşulur və bu onun diplom müdafiəsini bir neçə müddət gecikdirir. Rəssam döyüşlər arası fasilələrdə albomunu və karandaşını yerə qoymamış, eskizlər etməyə davam etmişdir. Gənc rəssam müharibə illərində 400-dən çox təsvirlər, plakatlar və karikaturalar yaradır. [4]

A.İ.Xarşak müharibədən qayıtdıqdan sonra diplom işini davam etdirir. Rəssam öz xatirələrində söyləmişdir ki, "müharibədə gördüyüm çətinliklər, ağır itkilər mənim yaddaşımda dərin iz buraxıb". O, müharibə illərində gördüklərini, yaşadığı qorxunc hissləri və düşüncələri diplom işi olan "Leninqrad uğrunda döyüşdə" («В борьбе за Ленинград», 1946-1947-ci illər) adlı ofortlar seriyasında əks etmişdir. Rəssama diplom işinə görə yüksək qiymət verirlər. Ancaq "Leninqrad uğrunda döyüşdə" («В борьбе за Ленинград») müharibə mövzusunu tam şəkildə əhatə etmir. O, sonralar bu mövzuya yenidən qayıdaraq, "1941-1945" adlandırılan 30 ofortdan ibarət monumental qrafik silsiləni yaradır. Bundan qabaqki silsilə əsərlərində olduğu kimi rəssam bir neçə ildən sonra yaratdığı bu qrafik silsiləsində də, müharibə mövzusunu, cəbhədə iştirakı zamanı gördüklərini ön plana çəkir. [2]

Rəssamın əsərləri Rusiyanın və Sovet İttifaqına daxil olan respublikaların bir çox müzeylərində sərgilənir və sanki rəssam izləyiciləri canlı müşahidələri əsasında çəkdiyi dünya müharibəsinin bütün ağırlığını və çətinliyini duymağa və hiss etməyə çağırır.

5 may 2015-ci ildə faşizm üzərində qələbənin 70 illiyi münasibəti ilə Azərbaycan Milli İncəsənət Muzeyində Aleksandr İsaakoviç Xarşakın fərdi sərgisi keçirilmiş və sərgidə onun ofort texnikasında yaratdığı 30 əsəri nümayiş etdirilmişdir. Sərginin açılışı möhtəşəm şəkildə keçirilir. Gələn qonaqlar arasında rəssamın oğlu, Sankt - Peterburqlu rəssam Andrey Aleksandroviç Xarşak da olur. O, A.İ.Xarşakın ofort teknikasında olan silsilə əsərləri ilə bərabər L.S.Marxasyovun "Sevimlilər və başqaları" kitabına çəkdiyi illüstrasiyalarını da Milli İncəsənət Muzeyinə hədiyyə edir. [1]

Hazırda A.İ.Xarşakın Böyük Vətən Müharibəsi mövzusunda yaratdığı ofortlar seriyası Azərbaycan Milli İncəsənət Muzeyinin Fond şöbəsinin Qrafika bölməsində mühafizə olunur.

A.İ.Xarşakın müharibə mövzusunda çəkdiyi ofortlar seriyasına daxil olan bir neçə qrafik əsərlərindən - “Şəhər - Qala” (1966), “Bu Rastrellidir” (1967), “Leninqradlılar” (1967),“Yetim” (1967),“Yaddaş”(1968), “Bu təkrarlanmamalıdır” (1984) və s. xüsusilə təqdirə layiqdir.

Ofortlar seriyasına daxil olan əsərlərdən biri də “Şəhər-Qala” (1966. Kağız, ofort) əsəridir (Şəkil 2). Burada soyuq qış günü qarla örtülmüş şəhərin təsviri verilib. Kompozisiyanın mərkəzi hissəsindəki açıq sahədə, şaxtadan donmuş Neva çayı, ön planda isə, şəhərin müdafiə xəttini təşkil edən ağır daşlar və sökülmüş dəmiryol relsləri təsvir edilib. Arxa planda rəssam dağıdılmış və yandırılmış yaşayış binalarının və tarixi abidələrin təsvirini sxematik göstərsədə, müharibənin törətdiyi mənzərəni tamaşaçısına çatdıra bilmişdir. Şəhər səssiz və sakitdir. Yerli sakinlərin təsvir olunmaması tamaşaçıda tərk edilmiş şəhər təəsüratı yaradır. Rəssam əsəri elə bir səpkidə təsvir etmişdir ki, ona tamaşa etdikdə soyuq qış gecəsində əsən küləyin uğultusunu duymaq, müharibənin törətdiyi çətinlikləri aydın şəkildə görmək olur.



**Şəkil 2. Şəhər-Qala. (1966. Kağız, ofort)**



**Şəkil 3. Bu Rastrellidir. (1967. Kağız, ofort)**

Böyük Vətən Müharibəsində Rusiyanın bir çox şəhərləri dağıntılara məruz qalmışdı. Nəticədə müharibə nəinki insanlara, o cümlədən şəhərin bir neçə tarixi – memarlıq abidələrinə, kilsələrinə də təsirsiz ötməmişdir. Xarşak şəhərin yararsız hala düşmüş tikililərini bu mövzuda çəkdiyi ofortlar seriyasında ürək ağrısı ilə vurğulayır. “Bu Rastrellidir” (1967. Kağız, ofort) kompozisiyasında möhtəşəm sarayın xarabalığa çevrilməsi bütün leninqradlılar kimi Xarşakın da ürəyində dərin iz buraxır.(Şəkil 3)

A.İ.Xarşak müharibə dövründə qadınların göstərdikləri fədakarlıqları əsərlərində dəfələrlə ön plana çəkmişdir. Onlardan “Leninqradlılar” (1967. Kağız, ofort) adlı qrafik əsərini qeyd etməmək mümkün deyil. (Şəkil 4) Kompozisiyanın sağ və sol hissələrində, arxa planda sxematik çəkilmiş leninqradlı qadınlar düşmən tərəfindən dağıdılmış evlərindən salamat qalan əşyalarını aparırlar. Ön planda, mərkəzdə göstərilmiş iki qadın isə soyuq, qarlı havada bir-birlərini qucaqlayaraq getməyə çalışır. Bu qadınlar ağır itkilər verməsinə baxmayaraq yenə də ayaqdadırlar və sona qədər mübarizə aparırlar. Rəssam tamaşaçının diqqətini monumental çəkilmiş iki yaşlı qadının simasına yönəldib.



**Şəkil 4. Leninqradlılar. (1967. Kağız,ofort)**



**Şəkil 5. Yetim. (1967. Kağız, ofort)**

Tarixin ən qanlı müharibəsi kimi tanınan İkinci dünya müharibəsində çoxlu əsgərlər və dinc əhali həlak olmuş və itkin düşmüşdür. Ancaq bu qurbanların dəqiq sayı məlum deyildir. Müharibə nəticəsində milyonlarla ailələr və uşaqlar başsız, yetim qalmışdırlar. Rəssam bu acınacaqlı hissəni yaradıcılığında vurğulayaraq, “Yetim” (1967. Kağız, ofort) adlı qrafik əsərində, xarabalıqlar fonunda, qarlı qış gecəsi, boş sahədə tənha qalmış və nə baş verdiyini anlamağa çalışan kimsəsiz bir uşağın çətin anını təsvir etmişdir. (Şəkil 5) Xarşakın digər ofortlarında olduğu kimi fon yenə də tünd rəngdədir. Ön planda, əynində qısa gödəkcə və başında papaqla verilmiş kimsəsiz uşaq ağzını şərflə bağlayıb və şaxtadan donan əllərini bir-birinə sıxıb.

Uşağın izləyiciyə doğru baxan gözləri rəssam tərəfindən dəqiqliklə qeyd olunub. Rəssam burada müharibənin daha bir acınacaqlı tərəfini göstərib.

A.İ.Xarşak "Leninqradlılar" (1967. Kağız, ofort) adlı qrafik əsərində olduğu kimi "Yaddaş" (1968. Kağız, ofort) əsərində də dünya müharibəsinin bütün çətinliklərini görmüş, əzab-əziyyətə məruz qalmış rus qadınının ümumiləşdirilmiş obrazını ön plana çəkib. (Şəkil 6) Rəssam, tünd rənglər üstünlük təşkil edən əsərdə qadının yarı açıq qalmış qollarını və dəqiq üz cizgilərini ağ tonlarla işləyib. Arxa planda, ağ ştrixlərlə, cərgə ilə düzülmüş əsirlər faşist əsgərləri tərəfindən aparılırlar. Qadının arxasında gizlənən uşaq qorxu içindədir. Çox çətin vəziyyətdə olan qadın bütün bunlara baxmayaraq ruhdan düşmür və öz gücünü toplayaraq möhkəm durmağa çalışır.



**Şəkil 6. Yaddaş. (1968. Kağız, ofort)**



**Şəkil 7. Bu təkrarlanmamalıdı. (1984. Kağız, ofort)**

A.İ.Xarşak faşist əsgərlərinin yerli sakinlərə qarşı törətdiyi amansız vəhşilikləri də çəkdiyi ofortlarında xüsusilə önəmsəmişdir. O, canlı şahidi olduğu bu hadisələri unuda bilmir və bacardığı qədər real səpkidə əks etməyə çalışırdı. "Bu təkrarlanmamalıdır" (1984. Kağız, ofort) əsəri bu mövzunu tam dolğun şəkildə göstərir. (Şəkil 7) Kompozisiyanın ikinci planında, nisbətən kiçik həcmdə dar ağacı və dar ağacından asılmış qadın və kişi firqurlar sxematik çəkilmişdir. Ancaq rəssam onların cansız bədənlərini, qadının solğun üz cizgilərini və ön planda, tutduğu işdən məmnuniyyət hissi keçirən faşist əsgərinin böyük həcmdə olan təsvirini aydın göstərib. O, kinayəli şəkildə gülərək üzünü tamaşaçıya tərəf tutub. Rəssam onun başındakı kaskanın üzərində olan faşist sivastikasını göstərməklə onun alman əsgəri olduğunu nəzə çatdırıb. O, əsərdə qara tonlara üstünlük verərək kompozisiyanın məzmununu izləyicilərə daha dolğun şəkildə açmağa çalışıb.

A.İ.Xarşak Dünya müharibəsinin ən acınacaqlı tərəflərini, müharibənin törətdiyi vəhşilikləri olduğu kimi, tam gerçəkliyi ilə öz əsərlərində göstərib. Ən maraqlı tərəfi isə budur ki, o, bu kompozisiyaları özündən deyil, müşahidələri əsasında əks edib.

Rəssamın yaratdığı əsərlər bu gün də nəinki Rusiyada, o cümlədən bir çox ölkələrdə də yüksək qiymətləndirilir və sərgilənir.

A.İ.Xarşak Vətəndaş müharibəsində iştirakına görə Qırmızı Əmək Bayrağı, Vətən müharibəsi, Qırmızı ulduz ordenlərinə və Rusiya Feferasiyasının əməkdar rəssamı adına layiq görülür.

A.İ.Xarşak sonralar müstəqil yaradıcılıq fəaliyyəti ilə məşğul olmağa başlayır, publisistika sahəsində də öz nəaliyyətlərini davam etdirir. Rusiyanın tanınmış yazıçıları Lev Nikolayeviç Tolstoyun "Diriliş" («Воскресение»); Aleksey Maksimoviç Qorkinin "Uşaqlıq" («Детство»), "İnsanlar arasında" («В людях») və "Mənim universitetlərim" («Мои университеты») əsərlərinə illustrasiyalar yaratmışdır. O, daha çox tarixi və Böyük Vətən müharibəsi ilə bağlı olan mövzularda əsərlər çəkir. [2]

A.İ.Xarşak 14 sentyabr 1989-cu ildə Sankt – Peterburq şəhərində vəfat etmişdir. Rəssamın bu təkrarolunmaz sənət əsərləri keçən əsrdə olduğu kimi, bu gün də böyük marağa səbəb olur. Əsərlərin maraq oyadan hissəsi rəssamın, bu çətin və dəhşətli anları öz müşahidələri əsasında çəkməsidir. Bununla o, bizə tarixin ən qanlı faciələrindən olan dünya müharibəsinin canlı təsvirini vermiş olur.

## Ədəbiyyat:

1. Azərbaycan Milli İncəsənət Muzeyinin Fond şöbəsinin Qrafika bölməsinin toplusundan.
2.Александр Исаакович Харшак. Ленинград «ХУДОЖНИК» РСФСР 1986. Автор: А.Земцова
3.http://www.qoos.ru/people/rupainters/aleksandrharshak/
4. http://www.kgallery.ru/new/86.html

## Graphic works of Alexander Isaakovich Kharshak among the collections of Azerbaijan National Museum of Art

**Summary**

The honored artist of Russia, St. Petersburg artist Alexander Isaakovich Kharshak, throughout his creativity created works in the field of easel graphics and book illustrations, executed in the technique of etching. The tragedies and horrors of World War II, seen at the front, the artist with great skill displayed in

his monumental series - "The Battle of Leningrad" and "1941-1945", consisting of 30 etchings. The article gives complete information about the life and work of A.I. Kharshak, and also tells about etchings from the Graphics Fund, presented as a gift to the museum by his son, Andrei Aleksandrovich Kharshak, after a personal exhibition of the artist.

**Графические произведения Александра Исааковича Харшака в собрании Азербайджанского национального музея искусств**

**Резюме**

На протяжении всего своего творчества, заслуженный художник России, петербургский художник Александр Исаакович Харшак, создавал непревзойденные произведения в области станковой графики и книжной иллюстрации, исполненные в технике офорта. Трагедии и ужасы Второй мировой войны, увиденные на фронте, художник с огромным мастерством отобразил в монументальных сериях - «Битва за Ленинград» и «1941-1945», состоящей из 30 офортов. В статье дается полная информация о жизни и творчестве А.И.Харшака, а также рассказывается об офортах из фонда «Графика», преподнесенных в дар музею сыном - Андреем Александровичем Харшаком, после персональной выставки художника.

**Rəyçi: sənətşünaslıq üzrə fəlsəfə doktoru X.Əsədova**

**Əmirova Fərəhbanu HacıRza qızı**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
banu.memar@mail.ru

# ORTA ƏSRLƏRDƏ BAKI HAMAMLARI

***Açar sözlər:*** *Bakı, İçərişəhər, hamam, memarlıq , interyer, eksteryer*
***Keywords:*** *Baku, İnner Sity, bath, architecture, interior, exterior*
***Ключевые слова:*** *Баку, Ичеришехер, баня, архитектура, интерьер, экстерьер*

Hamam ictimai bina olaraq bütün zamanlarda vacib rol oynamışdır. Tarixən belə hesab olunub ki, hamamlar insanların həyatında həm fiziki, həm mənəvi “təmizlənən “ bir yerə çevrilmişdir.Orta əsrlərdə onlar şəhər memarlığında əsas tikililərdən sayılırdı. Hamamlar, adətən saray və dini komplekslərin ərazilərində və əlbəttə ki, şəhərin giriş qapılarının yaxınlığında, karvan yollarına yaxın tikilirdi.

Bakı hamamlarının qədim tarixi var. Köhnə şəhərdə orta əsr şəhər memarlığının ən zəngin xüsusiyyətləri ilə fərqlənən bir neçə hamam var. Bu hamamlar Şərq hamamlarıının xarakterik xüsusiyyətlərini daşıyır : hamamın bir hissəsi yer səviyyəsindən aşağı, digər hissəsi yerin üstündə olduğu üçün hamam yayda sərin, qışda isti olurdu.



*Şəkil 1*

Şərqdə hamamların populyarlıq qazanması iqlim şəraiti ilə bağlı idi. İsti iqlim insanları tez – tez yuyunmağa vadar edirdi. Eyni zamanda hamam həm profilaktik ( sanitariya – gigiyenik ), həm də müalicəvi xarakter daşıyırdı.

İlk Şərq hamamı çox sadə və primitiv olmuşdur. Hamam cəmi bir məkandan ibarət idi; buxarda intensiv tərləyən insanlar bədənlərini xüsusi cod parçadan tikilmiş “ kisə “ ilə sürtüb kir çıxarırdılar. Bundan sonra üzərlərinə təmiz su tökərək yaxalanırdılar və nəticə çox mükəmməl olurdu. Hamamda bu cür yuyunma çox əlverişli idi və ucuz başa gəlirdi: su az işlənir, sabun əvəzinə kül, qum və ya arı mumundan hazırlanmış xüsusi pastalardan istifadə olunurdu.

Bakı hamamlarının isə özəllikləri var idi. Burada ümumi bir qayda olaraq lüt çimmək qəbul olunmurdu və müsafir hamama daxil olanda onlara soyunma otağında hamamçı ( cumadar ) tərəfindən “ fitə “ təqdim olunardı. Fitə qırmızı rəngli parça olub 2 cür növü vardı : darayı və mərcanı. Darayı fitə ipəkdən, mərcanı isə sadə iplikdən toxunurdu. İpək fitələr varlı və şəhərin mötəbər adamlarına təqdim olunurdu. Varlıların çoxu fitə və qətifələrini evdən özləri ilə gətirirdilər.



*Şəkil 2*

Bakı hamamları suya və rütubətə davamlı daşlardan tikilirdi. Çöl divarlar bəzəkli kaşı daşlarla işlənərdi. Bu tikili, adətən iki hissədən ibarət olurdu: bayır və içəri hissələr. Bayır hissə soyunub – geyinmək üçün, içəri hissə çimmək üçün istifadə edilirdi. Bu iki hissəni ensiz dəhliz birləşdirirdi. Günbəzlərdə qoyulan kiçicik pəncərələrdən hamama işıq düşürdü. Suyu qızdırmaq üçün hamamın xüsusi ocaqxanası var idi ki, buna da " külxana " deyərdilər. Su əsasən neftlə ( qatranla ) qızdırılırdı, amma bəzən odundan da istifadə edilirdi. Hamamların içərisində üstü örtülü olan bir hovuz vardı. Burada həmişə isti su olardı. Adamlar kisələnib sabunlanandan sonra burada yaxalanıb təmizlənirdilər. Bu hovuz " xəzinə " adlanırdı. Soyunma otaqlarında səki və paltar asmaq üçün yerdən 60 sm hündürlükdə taxçalar düzəldilirdi. Varlılar soyunan hissədə səkilərə xalça – palaz döşənir, ayaq yaxalamaq üçün laxanlar qoyulur, istirahət üçün hər cür şərait yaradılırdı. Zənginlər üçün nəzərdə tutulan səkidə əlavə olaraq üzərinə döşəkçə və mütəkkələr düzülmüş taxt da qoyulurdu. İstəyənlərə çay, qəlyan verilir, bəzən nərdtaxta da gətirilirdi.

Hamam bir gün kişilər üçün, bir gün qadınlar üçün təyin edilmişdi. Qadınlar olan gün hamam səs – küylü olardı. Uşaqların ağlaşması , analarının çığrtısı, arvadların dedi – qodusu bir – birinə qarışardı. Hərə özü üçün boxça bağlayıb içinə lazımi əşyaları qoyardı. Varlı xanımlar isə nəfis işləmələri olan və ağzı qıfılla bağlana bilən kiçik sandıqça (mücrü ) da götürürdülər ki, bunun da içərisində qiymətli zinyət əşyaları olardı. Oğul anaları çox zaman hamamda qız bəyənərdilər. Qadınlar üçün hamam həm də evdən, işlərdən azad olunacaq, dedi – qodu yapacaq, əsil istirahət edəcək bir yer idi. Ən əsas da onlar ən gözəl paltarlarını və qızıl – bəzək əşyalarını nümayiş etdirə bilirdilər.

Kişilər üçün isə hamam yalnız dəstəmaz almaq, yuyunmaq yeri deyil, eyni zamanda dostlarla bir yerə toplaşmaq üçün fürsət idi. Onlar burda söhbət edir, qəlyan çəkir, çay içib dərdləşirdilər.

Bakı hamamlarında həm də " Xınayaxdı " və " Bəy hamamı " kimi milli - ənənəvi toy mərasimləri də keçirilərdi. Həmçinin gəlini və bəyi xüsusi təntənə ilə hamama aparardılar. Bu mərasimlər indi də mövcuddur.

XX əsrədək Bakıda 2 tip hamam vardı : Asiya tipli və Avropa tipli. Axund hamamı,Mirzə hamamı, Qasımbəy hamamı, Hacı Qurban hamamı, Hacı Aslan hamamı, Ağa Nəzər hamamı, Tatar hamamı və s. hamamlar Asiya tipli hamamlara aiddir. Bakı hamamlarının çoxunun bayır divarlarını yağlı boya ilə çəkilmiş rəsm əsərləri bəzəyirdi. Bu əsərlərin mövzusu ən çox " Leyli və Məcnun " dastanından, Firdovsinin qəhrəmanlarının həyatından , müxtəlif nağıllardan götürülmüşdü. Bəzi hamamlarda ancaq yarıçılpaq qadın şəkilləri çəkilmişdi.

Avropa tipli hamamlar Asiya tipli hamamlardan ümumi otaqlardan başqa xüsusi nömrələrin mövcudluğu ilə fərqlənirdi. Hər nömrə bəzəkləri və rəngarəngliyi ilə fərqlənirdi. Bakıdakı Avropa tipli hamamlar bunlardır : " Fantaziya " , " Ermitaj ", " Dekadens ", " Moskva", "Mir" və s. Ən çox fərqlənəni "Fantaziya" hamamı idi. Bu hamam gözəlliyi, rahatlığı, nəfis interyer həlli ilə və komfortu ilə çox fərqlənirdi.Uyğun olaraq qiymətlər də çox baha idi. Salonda yerləşdirilən gül dibçəkləri və və nadir bitkilər canlı təbiət təəssüratı yaradırdı.Fontanlı və içərisində qızıl balıqlar üzən hovuz isə interyerə xüsusi gözəllik

verirdi. Tavandan bahalı çilçıraqlar asılmışdıdı. Burdan ətrafa yayılan işıq şüaları möhtəşəm parlaqlıq , rəngarənglik, yaradırdı.

İçərişəhərdə hamamlar İçərişəhər kompleksində yerləşirdi:

**Şivanşahlar Saray hamamı** saray məscidinin və Şah sərdəbəsinin yanında ən aşağı meydançada tikilmişdir. Tikili hicri – qəməi tarixi ilə 848 – ci ( 1438 ) ildə I Şirvanşah Xəlilullahın qardaşı Qəzənfər tərəfindən inşa edilmişdir ( *Şəkil 3*). Qəzənfər İsgəndərlə müharibədən sonra Bakıda məskunlaşmışdı və Qaraqoyunlular dövlətinin hökmdarı idi.

Saray hamamı yalnız Şahın ailəsinə mənsub idi və ondan yalnız Şahın ailə üzvləri istifadə edə bilərdi. Hamam 1939 – cu ildə arxeoloji qazıntılar zamanı təsadüfən aşkarlanmışdır.



*Şəkil 3*

Saray hamamı 26 otaqdan ibarət olmuşdur. Plana əsasən görmək olur ki, hamam 2 böyük kvadratdan ibarətdir , dörd pilon ( naxışlı sütun ) onları xırda hissələrə ayırır. Bir qrup otaqlar — «çöl» — geyinib-soyunmaq üçün nəzərdə tutulub, «içəri» hissə isə çimmək üçün idi. Çimmək üçün olan hissəyə isti və soyuq su üçün hovuzlar qoşulmuçdu. İsti su saxlanan hovuzda onun qızdırılması üçün içərisində ocaq yandırılan xüsusi kamera yerləşirdi. Hamamı qatılaşdırılmış, sarı daş formasında bərkimiş, şam kimi yanan ağ neftlə (qatranla ) qalayardılar. Qızdırılma sistemi buxar kanalları vasitəsi ilə yuyunma otağınln döşəməsinin altı ilə gedirdi. Yuyunma otağından gələn isti hava axını geyinib-soyunma otağını da qızdırırdı.

Səyyah İ.Lerx 1733-cü ildə Bakıda olarkən, hamam barədə yazırdı: «O, xaricdən olduğu kimi, daxildən də gözəl bəzədilib».

Su anbarından ( ovdandan ) gələn su divarın yanında hamamın qazanxanasına — «külxana»ya tökülürdü və sonra onlar üçün xüsusi kanallar qurulmuş keramik borulara paylanırdı. Ovdana torpağın altındakı qaya massivində quraşdırılan pilləkənlərə aparan şiş uclu oyuqdan keçmək olardı, pilləkən 70-ci pillədə, böyük su anbarının yanında bitirdi. Bura su yeraltı kəhrizdən gəlirdi. Tikinti işləri zamanı qalanın divarının qərb hissəsində 10 metr dərinlikdə, dağlardan ovdana və Şirvanşahlar sarayına tərəf gələn qədim şəlalə aşkarlandı. Görünür, saray və hamam həmin su kəməri vasitəsilə təchiz olunurdu.

Otaqlar çox idi: geyinib-soyunma otağı, yuyunma otağı, «xəlvəti» — təklikdə çimmək üçün guşə. Hamamın otaqlarında dairə formasında kiçik hovuzlar və ayaqqabı üçün oyuqlar vardı. Kənardakı, bərpa olunmuş günbəzli hissədə günümüzədək yaxşı qalmış kaşı haşiyələr var.Hamam günbəzdə olan xırda deşiklərlə işıqlandırılırdı.

Hamamın sağ küncündə üstü günbəzli bir böyük və iki kiçik otaq vardır. Kaşı üzlüyə malik bu otaqların şəxsən şaha məxsus olduğu ehtimal olunur.

Ən qədim hamam lardan digəi XV əsrə aid edilən **Hacı Qayib ( Hacı Bani )** hamamıdır ( Şəkil 3 ). Bu hamam İçərişəhərdə, Qız Qalası ilə üzbəüz küçədə yerləşir. Hamam XV əsrin sonunda memar Hacı Bani tərəfindən Hacı Qayibin sifaişilə inşa edilmişdi. Hamam karvan yolunun üstündə yerləşdiyindən səyyahların və tacirlərin sevimli istirahət yeri olmuşdur.



*Şəkil 4*

Hamamın giriş portalı düzbucaqlı formasındadır. Hacı Qayib hamam kompleksi 3 qrupa bölünür: Giriş (gözləmə otağı), soyunma otağı və yuyunma otağı. Soyunma və yuyunma otaqları kiçik məkanlarla əhatə olunmuş səkkizbucaqlı mərkəzi zaldan ibarətdir. Zalın mərkəzində isti və soyuq suyu olan hovuz var.

Günbəzlər və dam örtüyü əyri konturlara malikdir və dəqiq işlənmişdir. Döşəmə daş plitələrlə ötülmüşdür. Bu plitələin altında saxsı borular və xüsusi kanallar yerləşdirilmişdir ki, bunlar vasitəsilə su qızan zaman əmələ gələn isti hava axını döşəməni qızdırıdı.

Hacı Bani hamam kompleksi 1964 – cü ildə axeoloji qazıntılar zamanı aşkar edilmişdir. Hazırda Hacı Bani hamamı milli əhəmiyyətli bina kimi qorunur.

**Ağa Mikayıl hamamı** XVIII əsrdə İçərişəhərin cənub – qərb tərəfində əsas küçələrdən biri sayılan Kiçik Qala küçəsində əslən Şamaxıdan olan Hacı Ağa Mikayıl tərəfindən tikilmişdir. Hamamın yerləşdiyi ərazi " Hamamçılar məhəlləsi " adlanıdı. Bu hamam digər hamamlar kimi yarımyeraltı yox, tam yerüstü tkilmişdir. Hamamın daxili stuktur quruluşu da digər hamamlardan fərqli olaraq xaçvari formada deyil, 2 böyük kvadatdan ibarətdir. Hamamın bu cür formada tikilməsi ərazinin kiçik hissələrə bölünməsi və onların da dam örtüyünün rahat qurulmasına şərait yaratmışdır.



*Şəkil 5*

Hamamın hər iki hissəsi sütunlarla doqquz kiçik hissələrə bölünmüşdür. Mərkəzi hissə böyük günbəzlə örtülmüşdür. Dörd künc hissə xaçvari tağlarla ayrılıb və kiçik günbəzlərlə örtülmüşdür. Dörd yan hissə isə sütunlarla mərkəzi hissə ilə birləşdirilmişdir. Hamamın digər hamamlardan fərqlənən tüstü bacası var. Bu hamamda Üzeyir Hacıbəyovun eyni adlı operettası əsasında çəkilmiş " O olmasın, bu olsun " filmindən fraqmentlər çəkilmişdir. Filmin baş qəhrəmanının adı ilə hamam " Məşədi İbad hamamı " kimi də çox məşhurdur. Ağa Mikayıl hamamı indiyə kimi fəaliyyət göstərir.

2010 – cu ildə hamam əsaslı şəkildə restavrasiya olunmuşdur. Bərpa işlərindən sonra bu tikili milli-tarixi abidə kimi daha çox turist çəlb edir.

**Qasım bəy hamamı** XVIII əsrdə I Şirvanşah Xəlilullahın hakimiyyəti dövründə İçərişəhərdə, Salyan darvazaları yaxınlığında tikilmişdir. Temperaturu stabil saxlamaq üçün digər Şərq hamamları kimi bu hamam da yarımyeraltı inşa edilmişdir( *Şəkil 6).*

Qasım bəy hamamının 2 – ci adı **"Şirin hamam"** idi. Belə ki, burada müsafirlərə çayla birlikdə müxtəlif növ şirniyyatlar təqdim olunurdu.

Hamam vestibüldən, soyunma və yuyunma otaqlarından, hovuz və qazanxanadan ibarətdir.Soyunma və yuyunma otaqları bir – birilə yanaşı olub xırda künc hücrələr vasitəsilə birləşdirilmişdir.Hamamın hər iki hissəsi xaçvarı formada tikilmişdir.Hər iki mərkəzi zalı küncləri kəsilmiş kvadrat formasındadır. Hər iki hissədə tikilinin perimetri boyunca su boruları inşa edilmişdir.



*Şəkil 6* .

Hamama giriş vestibül hissədəndir. Küçə ilə hamamın zəmin xətt fərqinə görə vestibüldə uzun bir pilləkən quraşdırılıb.Hamamın xarici görünüşü hündür olmayan yerüstü tikililər üzərində quraşdırılmış günbəzlərdən ibarətdir. Hətta belə bir deyim var ki, günbəzlərin sayı Qasım ağanın arvadlarının sayına bərabərdir.

1970- ci ildə hamamda aparılan bərpa işlərindən sonra burada " Yaşıl aptek " fəaliyyət göstərmişdir.

**Ağa Zeynal hamamı** XIX əsrdə Hacı Ağa Zeynalın sifarişi ilə İçəriişəhərdə yaşayış məhəlləsində tikilmişdir *( Şəkil 7).* Hacı Ağa Zeynal Bakı milyonçusu Hacı Məmmədkərim Ramamzanovun babasıdır. Hacı Ağa Zeynalın nəslinin davamçıları indiyə kimi Köhnə şəhərdə yaşayır.

Hamam yaşayış tikililərinin sisteminə daxil olub ondan seçilmir. Binanın daxili məkanı ənənəvi üslublara sadiq qalaraq soyunma və yuyunma otaqlarından, xəzinə (isti və soyuq su anbarı) və qazanxanadan ibarət olan əsas bölmələrdən ibarətdir. Ağa Zeynal hamamı XIX əsrin II yarısına aid mülki memarlıq abidəsidir.





*Şəkil 7*

## İstinadlar:

1. anl.az›down/meqale/azerbaycan/2010/aprel/…
2. icherisheher.gov.az›az/54-baths/
3. howlingpixel.com›i-az/Saray_hamamı

## Ədəbiyyat:

1. Qılman İlkin. BAKI VƏ BAKILILAR Mənbə: BAKI VƏ BAKILILAR (Üçüncü nəşri).ISBN-9952-426-12–7

2. Саламзаде, А. В. (1964). Архитектура Азербайдана XVI-XIX вв.. Баку: Издательство Академии наук Азербайджанской ССР.

## Baku baths in the middle ages

**Summary**

This article deals with the history of medieval baths in the Old City of Baku, the architectural composition, interior design, and interior design. Many sites, essays and literature were used in writing the article.

## Бакинские бани в Средние века

**Резюме**

В этой статье рассматривается история средневековых бань в Старом городе Баку, архитектурная композиция, дизайн интерьера и внутренняя структура бань. Многие сайты, очерки и литература были использованы при написании статьи.

**Rəyçi: dos. N.Ə.Ağayeva**

**Babayeva Ləman Hamlet qızı**
Azərbaycan Milli İncəsənət Muzeyi
L.Memmedova23@yandex.ru

# AZƏRBAYCAN-FRANSA MƏDƏNİ ƏLAQƏLƏRİNİN İNKİŞAFINDA MİLLİ İNCƏSƏNƏT MUZEYİNİN ROLU

***Açar sözlər:*** *Azərbaycan, Fransa, mədəni əlaqələr, sərgi, incəsənət*
***Key words:*** *Azerbaijan, France, cultural relations, exhibition, art*
***Ключевые слова:*** *Азербайджан, Франция, культурные отношения, выставка, искусство*

XXI əsrdə dünya dövlətləri arasında mədəni, siyasi, iqtisadi əlaqələr son dərəcə artmaqdadır. Azərbaycan da öz növbəsində son illərdə dünyada gedən bir çox mədəni proqram və lahiyələrin fəal iştirakçısıdır.

Tarixin bütün dönəmlərində Azərbaycan mədəniyyəti dünyanın qabaqcıl dövlətlərinin o,cümlədən Qərbin mədəniyyət beşiyi hesab edilən Fransanın diqqət mərkəzində olmuşdur.

Fransa ilə Azərbaycan arasındakı məsafənin böyük olmasına baxmayaraq ,iki ölkənin daima möhkəm mədəni və intellektual əlaqələri olmuşdur.Bu ölkələr arasında mədəni əlaqələr son dövrlərdə daha geniş şəkildədir və ölkəmiz üçün mühüm əhəmiyyət kəsb edir.Qərbi Avropanın aparıcı ölkələrindən olan Fransada mədəniyyətimizin təbliği dünya ölkələrinin ölkəmizlə,mədəniyyətimizlə daha yaxından tanış olması üçün mühüm əhəmiyyət kəsb edir.

Azərbaycan-Fransa mədəni əlaqələrinin təşəkkülündə M.A.Şahtaxtinski, C.Hacıbəyov və Ə.Topçubaşovun xidmətləri xüsusi qeyd edilməlidir.AXC-nin süqutu nəticəsində mühacirlərin çox hissəsinin Fransaya üz tutması Azərbaycan-Fransa mədəni əlaqələrinin inkişafına təsirsiz ötüşməmişdir. Fransada mühacirətdə olan azərbaycanlılar mədəni əlaqələrin inkişaf etməsinə ciddi təşəbbüskarlıq göstərərək, ölkədə Azərbaycan mədəniyyətini tanıtmağa səy göstərirdilər. [4]

Sovet İttifaqının süqutu elan ediləndən üç həftə sonra Fransa rəsmi olaraq Azərbaycanın müstəqilliyini tanımışdır. Bu qərarı Türkiyədən sonra qəbul edən Fransa Bakıda öz səfirliyini açmışdır. Avropanın inkişaf etmiş dövlətlərindən biri olan Fransa həmin tarixdən başlayaraq, Azərbaycanla siyasi, iqtisadi və mədəni sahələrdə əməkdaşlığı davam etdirmişdir. Ancaq 1992-ci il martın sonundan 1993-cü ilin axırlarınadək Azərbaycan-Fransa münasibətlərində soyuqluq özünü göstərmiş,yalnız ulu öndər Heydər Əliyevin siyasi hakimiyyətə qayıdışından sonra ölkələr arasında münasibətlər yaxşılığa doğru dəyişməyə başlamışdı.Hazırkı dövrdə ulu öndərin laiqli davamçısı İlham Əliyev Azərbaycan-Fransan mədəni,siyasi,iqtisadi əlaqələrinin inkişafında mühüm addımlar atır.

Günümüzdə beynəlxalq münasibətlərdə cərəyan edən proseseslər sübut edir ki,hər bir dövlətin dünya birliyində rolu və yeri hərbi,iqtisadi,geosiyasi,diplomatik resurslarla yanaşı mədəni,dünya ictimayyətinə göstərə biləcəyi intellektual və mənəvi-mədəni təsir imkanları ilə müəyyən edilir.

Bu gün dünyanın ən qabaqcıl ölkələrinin,həmçinin Fransanın ən məşhur muzeylərində Azərbaycan incəsənətinə xas müxtəlif maddi mədəniyyət nümunələri qorunub saxlanılır.Bu mədəniyyət nümunələri Azərbaycan mədəniyyətinin təbliğində və tanıdılmasında mühüm əhəmiyyət kəsb edir.

Fransa muzeylərində saxlanılan Azərbaycan sənətkarlıq nümunələrinin ən böyük qismini bədii toxuculuq məmulatları təşkil edir.Fransanın bir çox muzey və şəxsi kolleksiyalarında Azərbaycanın Şamaxı,Şəki,Gəncə,Naxçıvan və Təbriz kimi şəhərlərində toxunmuş yüzlərlə yüksək keyfiyyətli parçalarımız saxlanılır.

Parisin Dekorativ Sənətlər Muzeyində nümayiş etdirilən süjetli parçalarımız içərisində XVI əsrdə Təbriz toxucuları tərəfindən hazırlanmış üzərində qızılbaşlara məxsus paltar geyinmiş gənc atlı təsvir edilmiş ipək parça xüsusi əhəmiyyət kəsb edir. [1]

Dünyanın ən çox ziyarət edilən muzeylərindən sayılan Luvr muzeyində Azərbaycanca məxsus toxuculuq məmulatları, həmçinin, saxsı, kaşı, bədii metal,miniatür nümunələrimiz saxlanılır.Bunlardan 1330-1340-cı illərə aid edilən Firdovsinin "Şahnamə" əsərinə çəkilmiş üç miniatür xüsusi maraq doğurur. Muzeydə nümayiş olunaa 1190-cı il tarixli orijinal fiqurlu bir qab xüsusi ilə diqqəti cəlb edir.

Hazırda Azərbaycanın ən dəyərli xalçaları Parisin Dekorativ sənətlər muzeyində və Luvr muzeyində qorunub saxlanılır.

İyul ayının 2-də YUNESKO-nun Ümumdünya İrs Komitəsinin 43-cü sessiyası çərçivəsində çərçivəsində Azərbaycan Milli Xalça muzeyində "Azərbaycan mədəni irsi Luvr Muzeyində" adlı sərgi təşkil edilmişdir.Sərgidə Luvr muzeyindən gətirilmiş XVIII əsrin sonu XX əsrin əvvəllərinə aid nadir Azərbaycan xalçaları nümayiş etdirilir. Bu sərginin təşkil edilməsi,Luvr kimi dünya şöhrətli muzeydə Azərbaycan incəsənətinə aid xalçaların qorunub saxlanılması Azərbaycan-Fransa mədəni əlaqələri baxımından mühüm əhəmiyyət kəsb edir.

Azərbaycnın bir çox muzeylərində Fransa incəsənətinə xas mədəniyyət nümunələri qorunub-saxlanılır.

Azərbaycan Fransa mədəni əlaqələrinin inkişafında Azərbaycan Milli İncəsənət muzeyinin rolu böyükdür.Ölkənin əsas mədəniyyət ocaqlarından olan Milli incəsənət muzeyi Fransa incəsənətinə xas zəngin kolleksiyaya sahibdir.Bu kolleksiya əsasən XVII əsrdən XX əsrin əvvəllərinə qədərki dövrü əhatə edir.

Muzeydə Fransa incəsənətinə məxsus rənkgarlıq,qrafika,heykəltarşlıq nümunələri,metal əşyaları,çini,toxuma,mebel aksesuarlarından ibarət üç yüzdən artıq ekspanat var. Bunların arasını XVIII əsrdən XX əsrin əvvəllərinə qədərki dövrü əhatə edən, mövzuları əsasən bibliyadan və antik mifalogiyadan götürülmüş sujetləri olan rəngkarlıq nümunələri tutur.

Burada məşhur Barbizon məktəbinin nümayəndələrinin (Jül Düpre) rəsmi portret janrında və (Jan-Jozef Benjamen-Konstan) romantik üslubda çalışan rəssamların, həmçinin XIX-XX əsr təsviri sənətində axtarış və yeniliyə meyilli müəlliflərin əsərləri saxlanılır.

Muzeyin Fransaya aid qrafik kolleksiyasına XVII-XIX əsrlərə aid 100 dən artıq əsər daxildir. Buraya Fransanın məşhur qravür ustalarının Jan Dolle, Qeorq Ville, Jak Kallo, Nikolya de Larmessen de Rober Qayyar və s.nin əsərləri daxildir.

Heykəltaraşlıq kolleksiyası əsasən interyerlərin bəzədilməsi üçün nəzərdə tutulan kiçik həcimli əsərlərlə təmsil edilir.Heykəllərin bir çoxunun müəllifi XIX əsrin məşhur fransız heykəltəraşı Mari-Rozil Bonerdir.[3]

2012-cı ildə martın 10-da Azərbaycan Milli İncəsənət Muzeyində Heydər Əliyev Fondunun təşəbbüsü və dəstəyi ilə "Fransa inciləri. Fransız incəsənəti Renessansdan bu günədək" mövzusunda sərgi açılmışdır.(Şəkil 1)



Şəkil 1.Fransa inciləri. Fransız incəsənəti Renessansdan bu günədək.

Sərgidə nümayiş etdirilən eksponatların mühüm hissəsini Versal sarayından, Luvr və Orse muzeylərindən, Pompidu Mərkəzindən, Fransa Milli Kitabxanasından gətirilmiş əsərlər təşkil etmişdir. Burada həmçinin Paris şəhərinin məşhur Karnavale Muzeyi, Kiçik Saray, Moda və Geyim, Konyak Je və Romantik Həyat muzeylərinin möhtəşəmliyi ilə seçilən əsərləri təqdim edilmişdir. Bundan başqa burada Nant, Kan, Ruan, Amyen, Strasburq, Reyms, Bezanson, Dijon, Lion, Qrenobl, Perpinyan, Monpelye, Eks-an-Provans, Nitsa, Ayaçço və digər şəhərlərin muzey eksponatlarından nümunələr də tamaşaçıların ixtiyarın verilmişdir.[2 ]

Nümayiş olunmuş sənət əsərlərinin miqyasına və müxtəlifliyinə görə nadir olan "Fransa inciləri. Fransız incəsənəti Renessansdan bu günədək" sərgisində bu ölkənin sənət adamlarının yüksək yaradıcılıq ənənələri, ideyaları, zövqləri müxtəlif texnikalara malik xalçaçılıq, təsviri incəsənət nümunələri, dekorativ sənət əşyaları, qravüra və fotoşəkillər vasitəsilə təqdim edilmişdir. Bu sərgi Fransanın bütün dünyada şöhrət tapmış zəngin mədəniyyətini nümayiş etdirməklə bərabər, onun qədim tarixinə də bir səyahət kimi yadda qalmışdır. Xronoloji ardıcıllıqla təqdim olunan eksponatlar Renessansdan bu günədək fransız mədəniyyətinin inkişafını izləmək imkanı vermişdir.

Bu sərgidə ilk dəfə olaraq Fransanın ən məşhur sənət korifeyləri olan Pussen, Qryoz, İnqr, Deqa, Brak, Otonyel, Roden kimi sənət ustalarının boyakarlıq və heykəltəraşlıq əsərlərini, incəsənət əşyalarını, qobelen və qravüraları bir yerdə nümayiş etdirilmişdir.Dünyanın mədəniyyət beşiyi hesab edilən Fransanın İntibah çağlarından ötən əsrədək zəngin mədəni inkişaf dövrünü əhatə edən bu sərgi ölkəmizdə böyük maraqla qarşılanmış,Azərbaycan mədəni həyatında mühüm iz buraxmışdır.

2016-cı il Multikulturalizm ili,Milli İncəsənət muzeyinin 80 illik yubileyi ərəfəsində muzeydə keçirilən "Fransa İncəsənəti"(Azərbaycan Milli İncəsənət Muzeyinin kolleksiyasından)adlı sərgi də həmçinin, böyük marağa səbəb olmuşdur.(Şəkil 2).Sərgidə Muzeyin Fransa incəsənətinə adi rəngkarlıq,qrafika,heykəltəraşlıq,çini kolleksiyasından ən parlaq nümunələr nümayiş etdirilmişdir. Sərgidə muzeyin rəngkarlıq kolleksiyasına aid məşhur



Şəkil 2.Fransa İncəsənəti.(Azərbaycan Milli İncəsənət Muzeyinin kolleksiyasından)

əsərlər,nadir qrafik əsərlər,XVI-XIX əsrdə məşhur fransız ustalarının yaratdıqları qobelenlər,fil sümüyü,ipək ,inkrustasiya olunmuş ağac və kağızdan hazırlanmış və ilk dəfə nümayiş etdirilən yelpik kollekiyası böyük marağa səbəb olmuşdur.Sərgidə elm və sənət nümayəndələri,Fransanın Azərbacandakı diplomatik səfiri Orelia Buşez də iştirak etmişdir. [3]

Milli İncəsənət Muzeyi 4 iyul 2019-cu ildə həmçinin,Bakıda keçirilən UNESCO-nun Ümumdünya irs Komitəsinin 43-cü sessiyası çərvivəsində,Fransanın ölkəmizdəki səfirliyinin ,AMEA Rəyasət Heyətinin ,Arxeologiya və Etnoqrafiya İnstitutunun dəstəyi ilə Fransa-Azərbaycan arxeoloqlarının birgə tədqiqatlarının nəticələrini üzündə əks etdirən sərgiyə ev sahibliyi etmişdir.Burada 10 il ərzində iki ölkənin arxeoloqlarının apardığı birgə tədqiqatlar nəticəsində əldə olunmuş,tarixi baxımdan mühüm əhəmiyyət kəsb edən mühüm ,nadir tapıntılar nümayiş etdirilir.(Şəkil 3)



Şəkil 3. Fransa-Azərbaycan arxeoloqlarının birgə tədqiqatlarının nəticələri.

Azərbaycan və Fransa mədəni əlaqələrinin öyrənilməsi, araşdırılması və qarşılıqlı mədəni əlaqələrin yüksək şəkildə inkişafı o baxımdan günümüzdə böyük əhəmiyyət kəsb edir ki,Fransa ermənilərin kütləvi şəkildə yaşadığı ərazilərdən biridir və burada Azərbaycan mədəniyyətinin təbliğinin bir növ onların mədəniyyətimizi saxtalaşdırmaq ənənəsinə qarşı çıxmış olur.

Azərbayan Fransa mədəni əlaqələri nəinki Azərbaycan mədəniyyətinin Fransada təbliği üçün vacibdir,həmçinin qərbin mədəniyyət beşiyi sayılan Fransa mədəniyyətinin Azərbaycan mədəniyyətinə təsir mühüm nəticələrə gətirib çıxarır.

**Ədəbiyyat:**

1.Rasim Əfəndiyev,Toğrul Əfəndiyev.Azərbaycan İncəsənəti Dünya muzeylərində.Bakı 2009.
2.Fransanın inciləri (Fransız incəsənəti və mədəniyyəti renesansdan bu günədək).ADAGP 2012.
3.Fransa İncəsənəti (Azərbaycan Milli İncəsənət Muzeyinin kolleksiyasından). Azərbaycan Milli İncəsənət Muzeyi .Bakı 2016.
4. http://sesqazeti.az/news/kivdf/361930.html

## The role of the National Museum of Art in the development of cultural relations between Azerbaijan and France

**Summary**

The cultural ties between Azerbaijan and France, whose history spans more than three hundred years, have allowed both nations to get to know each other better and closer. The Azerbaijan National Museum of Art plays an important role in the development of cultural ties between these countries. Over the years, French art exhibitions have been organized in the museum. It is also one of the main cultural centers of the country, which has a rich collection of French art. On December 18, 2018, after a major overhaul, the third building of the museum was opened. It has three rooms in a permanent exposition, demonstrating French art. In this article, you can learn more about the role of the National Museum of Art in the development of cultural relations between Azerbaijan and France.

## Роль Национального музея искусств в развитии культурных связей между Азербайджаном и Францией

**Резюме**

Культурные связи между Азербайджаном и Францией, история которых насчитывает более трехсот лет, позволили обоим народам лучше и ближе познакомиться друг с другом. Азербайджанский Национальный Музей Искусств играет важную роль в развитии культурных связей между этими странами. В разные годы в нём были организованы Французские художественные выставки. Также он является одним из главных культурных центров страны, обладает богатой коллекцией французского искусства. 18 декабря 2018 года после капитального ремонта был открыт третий корпус музея. В нём три зала в постоянной экспозиции, демонстрируют французское искусство. В этой статье можете подобнее узнать о роли Национального музея искусств в развитии культурных связей между Азербайджаном и Францией.

**Rəyçi:dos.Ə.Əliyev**

**Zərifə Nəbiyeva**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
Zarifanabiyeva96@gmail.com

# RAİS RƏSULZADƏNİN YARADICILIĞINDA PORTRET JANRININ İNKİŞAF TƏMAYÜLLƏRİ

***Açar sözlər:*** *Rais Rəsulzadənin təsviri sənət əsərləri, portret, mənzərə, natürmort*

***Key words:*** *Rais Rasulzade's fine art, portrait, landscape, still life*

***Ключевые слова:*** *Раиса Расулзаде, изобразительное искусство, портрет, пейзаж, натюрморт*

Azərbaycan rəngkarlığında portret janrı hər zaman əsas yerlərdən birini tutur. Rəngkarlığın peşəkar məktəbi yarandıgı vaxtdan portret, Azərbaycan rəssamlarının yaradıcılığında nəzəri diqqəti cəlb edir. Təbii ki, portret janrının əsas obyekti insandır, buna görə də onun mənəvi aləmi və cəmiyyətdəki mövqeyinin təsviri sənətin əsas mövzusunu təşkil edir.

Azərbaycan rəngkarlığında uzun illər ərzində portretlər əsasən yaradıcı ziyalılarla yanaşı, fəhlələrə, kolxozçulara, əmək qabaqcıllarına da həsr olunmuşdur. 1930-1950 ci illərdə Azərbaycan rəssamlarının yaradıcılığında yazıçıların, musiqiçilərin portretləri çoxluq təşkil edirdi. Xüsusən Orta əsrlər Azərbaycan klassik poeziyasının nümayəndələri olan Nizami, Vaqif, Füzuli, Nəsiminin, siyasət və elmdə məşhur Şah İsmayıl Xətai, Nəsrəddin Tusinin bərpa olunmuş portretlərini göstərmək olar. Bu, rəssamların öz mədəniyyət tarixinə münasibətindən, həmçinin müsabiqələrin və yubileylərin keçirilməsi ilə əlaqədar olurdu. Belə müsabiqələrin əhəmiyyəti həqiqətən böyükdür, belə ki, biz obrazlı da olsa məşhur Azərbaycan şairlərinin, mədəniyyət və elm xadimlərinin obrazları ilə tanış oluruq. Belə müsabiqələrin hazırlıq prosesində rəssamlar dərin elmi-tədqiqat işi aparırdılar, həqiqəti olduğu kimi yaratmağa çalışırdılar. Bu gün belə portretlər ən yüksək adlara layiq görülür, demək olar ki, qiymətli sənəd kimi xəzinəyə çevrilmişlər.

Qeyd etmək vacibdir ki, 1970-ci illərdə Azərbaycan rəssamlar nəsli sovet incəsənətinin ümumi hərəkatı, xüsusən Moskva məktəbi əsasında inkişaf etmişdir. Milli məktəblərlə mərkəz arasında müxtəlifliklər və təzadlar da mövcud idi. Azərbaycan rəssamlarının bu nəslinə gəldikdə isə demək olar ki, incəsənətdə yeni mərhələnin başlanması keçirilən gənclik sərgilərində aydın şəkildə görünürdü. Bu yenilik yetmişinci illərin hərəkatı ilə əlaqədar idi. Portret sahəsində, daha doğrusu portret janrı konsepsiyasında baş verən islahatlar həm Azərbaycan, həm də Moskva məktəbləri üçün çox əhəmiyyətli idi. Mərkəzdə olunan bütün dəyişikliklər Azərbaycan rəssamlarına aid deyildi. Ona görə də tənqidin nəticələri 70-ci illərin Azərbaycan rəssamlarına qismən şamil olunurdu.

Rais Rəsulzadənin bütün yaradıcı həyatı boyu, rəngkarlıgın əsas janrlarına müraciət etmişdir. Lakin Rais Rəsulzadənin portretə, çoxfiqurlu kompozisiya və mənzərələrə daha çox üstünlük vermişdir. Rais Rəsulzadənin əsərlərinin ümumi xüsusiyyətlərini bir qədər analiz etməyə cəhd göstərək: Rəssam humanist ideyalara önəm verən sənətkardı. Tablolarını tədqiq etdiyimiz zaman biz bunun daha aydın şəkildə şahidi oluruq. Onun portretlərində insana, onun mənəvi aləminə, dəyərlərinə, şəxsiyyətinə verilən dəyər çox güclüdür. Əsərlərinin hər bir detalı, hər bir elementin arxasında gizlənmiş kiçik detallar belə “qiymətlilik” ənənəsindən öz nəsibini almışdır. Portretlərinə nəzər yetirdiyimiz zaman hər bir obrazın hər bir fərdin ruhunu hiss edə bilirik, onun daxili aləminə səyahət edir, duyğularına şərik çıxırıq. Bir sözlə, biz sanki bir tablo yox canlı bir insanın qarşısında özümüzü hiss edirik.

Sənətkar obrazı elə təsvir edir ki, biz onun müdrikliyini, şəxsiyyət dəyərini duya bilir, bundan başqa tamaşaçı obraza hörmətlə yanaşır. Məhz sənətkar sayəsində, məhz onun sehirli fırçası sayəsində, məhz onun insanlarla bağlı sevgiylə döyünən qəlbi sayəsində o, buna nail olmuş və bu nailiyyət onu cəmiyyətə sevdirmişdir.

Rəsulzadənin portretləri içərisində biz “Nurida Atəş” adlı əsərini qeyd edə bilərik.



Rəssam kağız üzərində, qələm və tuşdan istifadə etməklə olduqca real qadın obrazı canlandırmışdır. Burada qrafikanın əsas ifadə vasitələri hesab olunan xətt və ştrixlərin rolunu xüsusiylə qeyd etmək lazımdır. Hər bir detal, hər bir kiçik element dəqiq yerinə yetirilmişdir. Qadının pozitivliyi , onun hissləri tamamilə canlı şəkildə təsvir edilmişdir. Qələm və ağ-qara rənglər vasitəsilə buna nail olmaq bir qədər çətin olsa da, rəssam bu işin öhdəsindən böyük bacarıqla gəlmişdir. Kağızın bozumtul ləkələrlə zəngin fonunda obrazın təsviri bütün reallığı ilə əks edilmişdir. Məlumdur ki, portret janrının əsas prinspi hər hansısa bir obrazın zahiri görünüşünü yox, onun hər kəs tərəfindən görünməyən xüsusiyyətlərini üzə çıxarmaqdan ibarətdir. Yəni rəssam qəhrəmanını elə təsvir etməlidir ki, tamaşaçı tablonu müşahidə edən zaman onun xarakterinə bələd ola bilsin. Bir sözlə, obrazın tamaşaçı ilə ünsiyyət qurması vacib şərtlərdən biridir və rəssam buna nail olmuşdur. Psixoloji portret nümunəsi olan bu tablo insana xoş duyğular bəxş edir.

Rais Rəsulzadə ağ-qara cizgilərlə yanaşı rənglər vasitəsilə də müxtəlif insanların obrazını canlandırmışdır. Onlardan biri İsmail Əliyevin portretidir. Göy göldə daha dəqiq desəm, Göycəkənddən olan İsmail Əliyevin surətini yağlı boya vasitəsilə kətan üzərində canlandıran rəssam onun bütün xarakterini müvəffəqiyyətlə əks etdirmişdir. Psixoloji portret janrına aid olan bu tablo vertikal formatda yerinə yetirilmişdir və realizm üslubundadır.Burada Göycəkəndin təbiəti qoynunda, ayaqüstə təsvir olunan obrazın individual aləmini dərk etmək mümkündür. Üz simasındakı qırışların hər biri dəqiqliklə işlənmişdir və simasındakı yalançı “gülümsəmə” onun xoşxasiyyətli, zəhmətkeş bir insan olduğuna işarədir. O Göyçəkənd kəndinin sadə, əməksevər sakinidir.



Bir məqamı qeyd edim ki, obraz kompozisiya nisbətən bir qədər iri ölçüdə təsvir edilmişdir. Elə təəssürat oyanır ki, sanki ön plandakı surətlə, arxa fondakı mənzərə arasında əlaqə yoxdur və ya mənzərə arxa fona sonradan əlavə olunmuşdur. Bu detal bir kompozisiya üzərində yerləşən predmetlər arasındakı əlaqəni nə qədər zəiflətsə də, əsas qəhrəmanın dolğun şəkildə “qavranılmasında”, onun daxili aləminin bütünlüklə əks olunmasında heç bir əngəl yaratmır.

Rəng həllində isə rəssam mənzərə əsərlərindən fərqli olaraq sərt yaxmalara yox, lokal rəng qammasına müraciət etmişdir. Əgər mənzərəldəki rənglər qamması bir-birinə qarışıq idisə, portretdə isə demək olar ki,

sözün əsl mənasında hər rəng müstəqil funksiyanı yerinə yetirir. İlk öncə obrazın bəyaz saçları və tünd göy geyimi diqqəti cəlb edir. Rəssamın bu iki rəngə müraciət etməsi təsadüfi deyildir. Bu iki rəngdən qarşılıqlı səpkidə istifadə olunması əsas diqqəti bilavasitə obraza doğru yönləndirir, həmçinin işıq mənbəyinin obrazın üz simasında daha çox əks edilməsi bu diqqətin daha da artırılmasına xidmət göstərir.

Rais Rəsulzadənin portret yaradıcılığı bununla kifayətlənmir. O, elə bir rəssamdır ki, o pozitiv hissləri tamaşaçılara aşıladığı kimi, insanların qorxuları, gərginlikləri, bir sözlə həyatın sərt üzü ilə də onları tanış edə bilir. Onun "Gizlində" adlı tablosu insan qorxularını dolğun şəkildə özündə əks etdirir.



Bu tablo repreSsiya qurbanlarına həsr edilmişdir və onların hər birinin real şəkildə təsvir olunması bir daha təsdiq edir ki, rəssam həqiqətən də onların dərdinə şərik çıxa bilmişdir. Əsərdə rəssam yağlı boya texnikasına müraciət etsə də burada təkcə iki rəng öz əksini tapmışdır: ağ və qara. Monoxrom rəng həlli çərçivəsində rəssam bu üç şəxsi tam həyati səpkidə canlandırmağa nail olmuşdur. Onların duyğuları,onların məqsədi, düçüncəsi demək olar ki, eynidir. Onların baxışları tamaşaçılarla daim ünsiyyət qurur. Bu baxışlar fərqli istiqamətlərə yönlənsə də onları birləşdirən ortaq bir hiss vardır- kədər və qorxu. Əsərin ağ-qara olmasının səbəbi bu üç obrazın simasında bütün repressiya qurbanlarının həyatlarının qara zindana çevrilməsiylə bağlıdır. Bir sözlə, 110x140 ölçüləri olan, və qrup portretə aid olan bu əsər rəssamın yaradıcılığının şedevrı hesab olunur.

**The trends in the development of the portrait genre in the Rais Rasulzade's creativity**

**Summary**

The main purpose of writing this article is to get acquainted with a great mass of Rais Rasulzade's creativity. First I gave some information about his life and later his creativity. Rais Rasulzade's is one of the most famous representatives of Azerbaijan's colorful realistic style. In the portrait, whether in landscape or still life, we face realistic tendencies. As a result of my small research, I have seen that the artist has been attentive to every aspect of the story, from the basic to the smallest details, and that these elements have something in common with each other.

**Направления развития жанра портрета в творчестве Раиса Расулзаде**

**Резюме**

Главная цель написания этой статьи - познакомиться с большой массой творчества Раиса Расулзаде. Сначала я рассказал о его жизни, а затем и о его творчестве. Раиса Расулзаде - один из самых известных представителей красочного реалистического стиля Азербайджана. На портрете, будь то пейзаж или натюрморт, мы сталкиваемся с реалистическими тенденциями. В результате моих небольших исследований я увидел, что художник был внимателен ко всем аспектам истории, от основных до мельчайших деталей и что эти элементы имеют нечто общее между собой.

**Rəyçi: dos. D.Hümbətova**

